# MÜQƏDDİMƏ

## *Rəhmli və Mərhəmətli Allahın adı ilə*

Həmd ancaq Allaha məxsusdur. Ona həmd edir, ancaq Ondan yardım və bağışlanma diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Ona sığınırıq. Allahın haqq yoluna yönəltdiyi kəsi heç kim azdıra bilməz, Onun azdırdığı kəsi isə heç kim haqq yoluna qaytara bilməz. Şəhadət verirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O təkdir və şəriki yoxdur. Şəhadət verirəm ki, Məhəmməd onun qulu və elçisidir.

## EV BİR NEMƏTDİR

Bu barədə Allah-taala Qurani-Kərimdə buyurur: **«Allah evlərinizi sizə məskən** [*yaşayıb dincəlmə yeri*] **etdi…».**[1]

Məşhur təfsir alimi İbn Kəsir bu ayəni şərh edərkən belə yazır: «Hər şeydən uca və ulu olan Allah bəndələrinə evlərini onlara məskən etdiyini qeyd etməklə nəsib etdiyi bütün nemətlərini sadalayır. İnsanlar isə Allahın onlara məskən olaraq bəxş etdiyi evlərinə sığınar, burada gözdən-qulaqdan uzaq olar və bütün mənfət növlərindən bu məskən sayəsində faydalanarlar».[2]

Ev bizlərə nə verir?! Məgər ev bizim hər birimizin qidalanması, ailə həyatı qurması, yatması və istirahət etməsi üçün müəyyən olunmuş bir yer deyilmi?! Məgər ev bizim hər birimizin həm xəlvətə çəkilməsi, həm də öz ailə üzvləri ilə birgə toplaşması üçün nəzərdə tutulan bir yer deyilmi?! Məgər ev qadının yad gözlərdən uzaq olması və qorunması üçün nəzərdə tutulmamışdırmı?! Bəli, bunu Allah-taala Qurani-Kərimdə belə vurğulayır: **«Evlərinizdə qərar tutun. İlkin cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın.** [*Bər-bəzəyinizi taxaraq evdən çıxıb özünüzü, gözəlliyinizi yad kişilərə göstərməyin!*]**…».**[3]

---

[1] ən-Nəhl, 80.
[2] Təfsir İbn Kəsir, 4/509.
[3] əl-Əhzab, 33.

Əziz oxucu! Əgər sən evsiz-eşiksiz qalıb müxtəlif sığınacaqlarda özlərinə yer tapan, küçə səkilərində gecələyən insanların və müvəqqəti çadır şəhərciklərində məskunlaşmış qaçqınların yaşayış tərzi barədə fikirləşsən, heç sözsüz ki, evin qədir-qiymətini və bunun nə kimi bir nemət olmasını anlamış olarsan.

Əziz oxucu! Əgər sən kiminsə həyəcanlı bir vəziyyətdə: "Mən evsiz-eşiksiz qalmışam, qalmağa heç bir yerim yoxdur. Hərdən birinin evində, hərdən də hər hansı bir çayxanada, parkda, dəniz kənarında gecələyir, yaxud da palltarımın asılqanı maşınım olur" – deməsini eşitmiş olsaydın, onda ev kimi bir nemətdən məhrum olmağın nəticəsində meydana gələn dağınıqlığın mənasını dərk etmiş olardın.

Allah-taala yəhudilərdən olan Bəni Nəzir qəbiləsindən intiqam alarkən onları bu nemətdən məhrum edərək öz yurd-yuvalarından didərgin saldı. Bu əhvalatı Allah-taala Quranda belə nəql edir: **«Kitab əhlindən kafir olanları** [*Mədinə ətrafında yaşayıb Məhəmməd əleyhissəlamın peyğəmbərliyini inkar edən Bəni Nəzir qəbiləsini*] **ilk dəfə** [*bir yerə*] **toplayıb öz yurdundan çıxardan** [*Şama sürgün edən*] **Odur.** [*Ey möminlər!*] **Siz onları** [*öz yurdundan*] **çıxacaqlarını güman etmirdiniz. Onlar isə öz qalalarının onları Allahın əzabından qoruyacağını zənn edirdilər. Amma Allahın əzabı onları gözləmədikləri yerdən gəlib ürəklərinə qorxu saldı. Belə ki, onlar evlərini həm öz əlləri, həm də möminlərin əlləri ilə uçurdub dağıdırdılar. Ey bəsirət sahibləri!** [*Bəni Nəzir qəbiləsinin başına gələnlərdən*] **ibrət alın!»[4].**

## MÜSƏLMANI AİLƏSİNİN DÜZGÜN TƏRBİYƏLƏNDİRİLMƏSİNƏ SÖVQ EDƏN AMİLLƏRDƏN BƏZİLƏRİ

**1.** Müsəlmanın özünü və ailəsini cəhənnəm atəşindən qoruması və daim yandırıb yaxan atəş əzabından uzaq olmasıdır.

---

[4] əl-Həşr, 2.

Belə ki, bu barədə Allah-taala Özünün müqəddəs kitabında buyurur: **«Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar** [*daşdan düzəlmiş bütlər*]**, xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurulduqlarını yerinə yetirən daş qəlbli** [*heç kəsə zərrəcə rəhm etməyən*] **və çox sərt təbiətli mələklərdir** [*zəbanilərdir*]**».**[5]

**2.** Ailə başçısının Qiyamət günü Allah qarşısında olarkən üzərinə düşən məsuliyyətin böyüklüyü.

Peyğəmbər ρ hədislərinin birində belə buyurur: *«Şübhəsiz ki, Allah-taala [Qiyamət günü] hər bir padşahı və ya hökmdarı öz rəiyyətləri barəsində və hər bir kişini də öz ailə üzvləri haqqında sorğu-sual edəcəkdir».*[6]

**3.** Evin insanın özünü qoruması, bütün şər hesab olunan əməllərdən salamat olması və şər əməllərin də insanlardan əl çəkməsi üçün bir məskən olması.

Həmçinin ev fitnələrin baş qaldırdığı zaman qanuni bir sığınacaqdır. Belə ki, Allahın elçisi ρ buyurmuşdur: *«Xoşbəxt o adamdır ki, dilinə hakim olmağı bacarsın, geniş evə sahib olsun və öz günahlarına görə göz yaşı tökməyi bacarsın [tövbə edə bilsin]!»*[7].

Peyğəmbər ρ başqa bir hədisində isə belə buyurur: *«Beş əməl vardır ki, kim onlardan birini yerinə yetirmiş olsa, Allaha zamin durmuş olar. Bunlar aşağıdakılardır: xəstəni ziyarət etmək, dəfn mərasimində iştirak etmək, Allah yolunda cihada qalxmaq, rəhbərin yanına onun məzəmmət və hörmətini qazanmaq məqsədilə daxil olmaq və evində oturaraq heç kəsin ona və onun da heç kəsə zərəri toxunmamaq».*[8]

---

[5] ət-Təhrim, 6.

[6] Hədisin isnadı **həsəndir**. Nəsai, İbn Hibban Ənəsdən rəvayət edib. «Səhih əl-Cəmi», 1775; «əs-Silsilətu əs-Sahih», 1632.

[7] Hədisin isnadı **həsəndir**. Təbərani, «əl-Avsat»da Sovbandan rəvayət edib. «Səhih əl-Cəmi», 3824.

[8] Əhməd, 5/241.

Digər bir hədisdə isə belə deyilir: *«Fitnələrin tuğyan etdiyi zaman insanın salamat olması onun bu günləri evində keçirməsidir».*[9]

Müsəlman qürbətdə olduqda pisliklərin çoxluğundan özünü müdafiə edə bilmədiyi zaman evdə oturmağın faydasını görmüş olur. Belə ki, bu zaman insanın özünü haram buyurulmuş əməllərdən və göz zinasından qoruması üçün artıq bir sığınacağı vardır və həmin insan bu sığınacaq vasitəsi ilə zövcəsini açıq-saçıq gəzərək özünü yad kişilərə nümayiş etdirməkdən, övladlarını isə pisliklərə qurşanmaqdan qorumuş olur.

**4.** Qeyd etmək lazımdır ki, insanlar əksər hallarda xüsusi ilə də qızmar yay günlərində, şiddətli soyuq havalarda, yağışlı günlərdə, günortadan əvvəl və sonra vaxtlarının çoxunu evlərində keçirirlər. İşləri və dərsləri bitirdikdən sonra qalan boş vaxtların ibadətdə keçirilməsi labüddür. Əks halda belə vaxtlar günahların işlədilməsi ilə itiriləcəkdir.

**5.** Bu amil yuxarıda göstərilən amillərin ən mühümüdür. Qeyd olunmalıdır ki, ailəyə göstərilən xüsusi diqqət müsəlman cəmiyyətinin yaranması üçün böyük bir vəsilədir. Şübhəsiz ki, cəmiyyət ailələrdən ibarətdir. Əgər cəmiyyəti hər hansı bir bina ilə müqayisə etmiş olsaq, onda görərik ki, hər bir ailə bu binanın bir kərpicini təşkil edir. Kərpiclərin yararlı və möhkəm olması isə cəmiyyətimizin Allahın hökm və qanunları əsasında daha güclü, Onun düşmənləri önündə isə daha dözümlü olması deməkdir. Həqiqətən, belə bir cəmiyyətdə xeyrin hakim qüvvəyə çevrilməsi və heç bir şər qüvvənin oraya nüfuz edə bilməməsi özünü bariz şəkildə göstərir.

Müsəlman ailədən cəmiyyətə tərbiyənin əsasları, nümunəvi təbliğatçı, elm tələbəsi, sadiq mücahid, əməlisaleh zövcə, tərbiyəçi ana və digər əməlisalehlər daxil olur.

Əgər mövzu əhəmiyyətli bir mövzudursa və evlərimizdə çoxlu günahlar, böyük qüsurlar, laqeydlik və ifratçılıq baş verirsə, onda belə bir sual meydana çıxır:

---

[9] Hədisin isnadı **həsəndir**. Deyləmi, «Müsnəd»də Əbu Musadan rəvayət edib. «Səhih əl-Cəmi», 3543.

**Ailələrin tərbiyəsi və islahı üçün hansı yollara əl atmaq lazımdır?**

Hörmətli oxucu! Suala cavab olaraq bu sahədə sənə bəzi nəsihətlər verəcəyik. Ümid edirik ki, Allah-taala bu işi faydalı edər və müsəlman ailəsinin yenidən dirçəlişi yolunda islam övladlarının bütün cəhdlərini bu sahəyə istiqamətləndirər.

Qeyd edəcəyimiz bu nəsihətlər iki mövzunu əhatə edəcəkdir. Birincisi, mənfəətlərin əldə edilməsi, bu yaxşı işlərin görülməsidir. İkincisi isə fəsadların dəf edilməsidir ki, bunun üçün də pis işlərdən çəkinmək lazımdır. İndi isə mətləbə keçməyin vaxtıdır.

## AİLƏ QURMAQ

### Nəsihət 1
### Gözəl həyat yoldaşı seçmək

Allah-taala bu barədə buyurur: **«**[*Ey möminlər!*] **Aranızda olan subay kişiləri və ərsiz qadınları, əməlisaleh** [*yaxud evlənməyə qabil*] **kölə və cariyələrinizi evləndirin. Əgər onlar yoxsuldurlarsa, Allah öz lütfü ilə onları dövlətli edər. Allah** [*lütfü, mərhəməti*] **geniş olan və** [*hər şeyi*] **biləndir!»**[10]**.**

Hər bir kişi özünə əməlisaleh zövcə seçərkən aşağıdakı hədislərdə vurğulanan motivlərə riayət etməlidir:

Peyğəmbər ρ buyurmuşdur:

*«Qadınla dörd şeyə görə nikah bağlanılar: var-dövlətinə, ləyaqətinə, gözəlliyinə və dininə görə. Ona görə əlini çirmələ, dindarla evlən».*[11]

*«Dünya bütünlüklə nemətlərlə doludur. Bu nemətlərin ən xeyirlisi isə əməlisaleh qadındır».*[12]

*«Şükr edən qəlbi, zikr edən dili və axirəti qazanmaqda sizə yardımçı olan mömin zövcəni seçin!»*[13]*.*

Başqa bir rəvayətdə isə belə deyilir:

*«…dünya və dinində sənə yardımçı olan əməlisaleh zövcəni seç. Bil ki, bu insanların yığıb topladıqlarının ən xeyirlisidir».*[14]

*«Tez-tez doğan və sevən qadınlarla evlənin. Həqiqətən, mən qiyamət günü başqa peyğəmbərlər yanında sizin say çoxluğunuzla fəxr edəcəyəm».*[15]

*«Bakirə qızlarla evlənin. Çünki onlar tez-tez doğan, daha çox xoş sözlər söyləyən və aza ən çox qane olanlardır».*[16]

Başqa bir rəvayətdə isə belə bir əlavə vardır: *«…çox az hiylə işlədənlərdir».*

---

10 ən-Nur, 32.
11 Buxari və Müslim. «Fəthul-Bari», 9/132.
12 Müslim, 1468; «Səhih əl-Cəmi», 3407.
13 Əhməd, 2825;Tirmizi və İbn Macə Sovbandan «Səhih əl-Cəmi», 5231 rəvayət edib.
14 Beyhəqi rəvayət edib. «Səhih əl-Cəmi», 4285.
15 Əhməd, Ənəsdən rəvayət edib, 3/254. «İrva əl-Qəlil», 6/195, **səhihdir.**
16 İbn Macə, 1861. «Silsilətu əs-Sahih», 623.

Qeyd olunmalıdır ki, əməlisaleh qadınla ailə həyatı qurmaq dörd xoşbəxtlikdən birisidirdir. Həmçinin pis qadının əri olmaq bədbəxtçilik hesab olunan dörd amildən birisidir. Bu fikir aşağıda qeyd edəcəyimiz Peyğəmbərin ρ səhih hədisində də öz təsdiqini tapmışdır: *«Xoşbəxtlik odur ki, həyat yoldaşın əməlisaleh qadındırsa, onu görərkən halın daha xoş olsun, ondan ayrı düşdükdə isə həm onun özündən, həm də öz əmlakından arxayın ola biləsən. Bədbəxtçiliyin bir növü də odur ki, həyat yoldaşınla üz-üzə gəlməyin halının pisləşməsinə səbəb olsun, onun dilindən daim əziyyət çəkmiş olasan və ondan ayrıldığın zaman nə onun özündən, nə də öz əmlakından arxayın ola biləsən».*[17]

Eləcə də müsəlman qadına təklif edilən oğlan barəsində də gözüaçıq və diqqətli olmaq lazımdır. Bunun üçün də aşağıdakı hədisdə göstərilən şərtlərə riayət edilməlidir.

*«Qapınıza qız istəməyə gələnin əxlaqını və dinini bəyənmiş olsanız, qızınızı onunla evləndirin. Əks təqdirdə edəcəyiniz hərəkətlər yer üzərində fitnə və böyük bir fəsadın baş verməsi ilə nəticələnəcəkdir».*[18]

Yeri gəlmişkən qeyd edilməlidir ki, insan evlənmək istədiyi şəxsin keçmişini çox dəqiqliklə öyrənməli, bu barədə soruşarkən əxlaq normalarına riayət etməli, əldə etdiyi məlumatlarda mötəbər mənbələrə istinad etməlidir ki, bu gələcəkdə ailədəki münasibətlərin pozulması və ya ailənin dağılması ilə nəticələnməsin.

Əməlisaleh kişi ilə əməlisaleh qadın bir yerdə olduqları zaman gözəl bir ailənin təməlini qoymuş olurlar. Təmiz, torpağı münbit bir məmləkətin bitkiləri Tanrının izni ilə bol və vaxtında yetişərək çıxar. Pis, torpağı qeyri-münbit bir məmləkətin bitkiləri isə yalnız çox çətinliklə, özü də az yetişər.

## Nəsihət 2
## Övrətin[19] saleh olmasına çalışmaq

---

[17] İbn Hibban və başqaları. «əs-Silsilətu əs-Sahih», 282.
[18] İbn Macə, 1967; «əs-Silsilətu əs-Sahih», 1022.
[19] Övrət burada arvad, zövcə mənasındadır.

Əgər övrət saleh bəndədirsə, bu necə də xoşbəxtlikdir və Allahın bəxş etdiyi bir nemətdir. Bu keyfiyyət olmadığı halda övrətinin islah edilməsinə çalışmaq ailə başçısının üzərinə düşən vacibatlardandır. Övrətin saleh bəndələrdən olmaması ilə adətən aşağıdakı hallarda rastlaşılır:

Kişi özü dinə yeni gəldiyinə görə dindarlığa əhəmiyyət vermədiyi üçün, evləndikdən sonra övrətini islah etmək ümidilə, yaxud da qohumlarının təzyiqi ilə dindar olmayan bir qadınla ailə həyatı qurur. Belə bir məqamda isə qolları çırmalayıb islah əməliyyatına başlamaq lazımdır. Lakin ər hər şeydən əvvəl bilməlidir ki, hidayət Allahdandır və islah edən də Odur. Allah-taala Zəkəriyyaya olan mərhəməti haqda Öz müqəddəs kitabında belə buyurur: **«Biz Zəkəriyyanın duasını qəbul buyurduq, ona Yəhyanı bəxş etdik və zövcəsini** [*doğmağa*] **qabil bir hala gətirdik...».**[20] İstər cismani, istərsə də dini baxımdan Allah-taala onun zövcəsini islah etmişdir.

İbn Abbasın τ təfsirinə görə əvvəl Zəkəriyyanın zövcəsi sonsuz idi, sonra isə doğmağa qabil oldu. Əta isə ayənin təfsiri haqda belə deyir: Zəkəriyyanın zövcəsinin dilində uzunluq var idi, Allah da bu qüsuru ondan götürdü.[21]

***Övrətin islah edilməsi yolunda bəzi tədbir və metodlar:***

1. Onun bir çox ibadət növləri ilə Allaha ibadət etməsinə diqqət yetirmək:

2. Aşağıdakı tədbirlərlə övrətin imanının qalxmasına çalışmaq:

a. Onu gecə namazlarını qılmağa sövq etmək.

b. Qurani-Kərimi oxutdurmaq.

c. Zikrlərin əzbərlətdirilməsi və münasib məqamlarda onların yada salınması.

ç. Sədəqə verməyə sövq etmək.

d. Övrəti faydalı islam ədəbiyyatları oxumağa həvəsləndirmək.

q. Elm və imandan bəhs edən faydalı islam kasetlərini dinləməyə həvəsləndirmək və bu növ kasetlərlə ona kömək etməyə davam etmək.

---

[20] əl-Ənbiya, 90.

[21] Təfsir İbn Kəsir, 5/364.

e. Övrət üçün dindar rəfiqələr tapmaq lazımdır ki, onlarla bacılıq əlaqələri qursun, yaxşı söhbətlər etsin və məqsədyönlü ziyarətlər həyata keçirsin.

c. Şəri övrətdən dəf etmək, şərin ona açılan qapılarını bağlamaq və övrəti pis rəfiqələrdən və pis yerlərdən uzaq saxlamaq.

# EVDƏKİ DİNİ AB-HAVA

## Nəsihət 3
## Evi Allahın zikri üçün bir məkana çevirin

Allahın elçisi ρ bu barədə buyurur: *«Allahın zikr olunduğu evlə Allahın zikrindən uzaq olan ev diri ilə ölünün misalındadır».*[22]

Evlərdə qəlblərin və ağızların Allahı daim zikr etməsinə, namazların qılınmasına, duaların edilməsinə, Quranın oxunmasına, ilahiyyat elmi məsələlərinin müzakirə edilməsinə və bu elmə aid müxtəlif növ kitabların oxunmasına lazımi şərait yaradılmalı və sadaladığımız ibadətlərin həyata keçirilməsi üçün ev bir məkana çevrilməlidir.

Hal-hazırda müsəlmanların yaşadıqları neçə-neçə evlər vardır ki, bu evlər Allahın zikr və ibadətlərindən uzaq olduğundan hədisdə də qeyd olunduğu kimi ölü evlər hesab olunur. Həmin evlərdə ancaq tütəklərdə ifa olunan şeytani bəstələri, nəğmələri, bundan əlavə qeybət, böhtan və iftira xarakteri daşıyan söhbətləri eşitmək olar. Gələn naməhrəm qohum və qonşular arasındakı açıq-saçıqlıq kimi qadağaların bir-birinə qarışdığı və günahlarla dolub-daşan bir evin vəziyyəti necə ola bilər?! Bu cür halların ayaq açdığı bir evə mələklər necə və nə üçün daxil olsunlar?! Buna görə də ey müsəlmanlar, evlərinizə zikr və ibadətin müxtəlif növləri ilə həyat verin ki, Allah da sizə öz mərhəmətini əsirgəməsin!

## Nəsihət 4
## Evlərinizi qiblə edin!

---

[22] Müslim Əbu Musadan rəvayət etmişdir, 1/539.

«Evlərinizi qiblə edin!» dedikdə burada evlərin namazgah və ibadətgah edilməsinə işarə edilir. Bu fikir aşağıdakı ayədə də öz əksini tapmışdır:

**«Musaya və qardaşına: "Camaatınız üçün Misirdə evlər tikdirib onları qiblə** [*namazgah*] **edin, namaz qılın və möminləri** [*zəfərlə, Cənnətlə*] **mücdələyin!" – deyə vəhy etdik».**[23]

İbn Abbas τ ayənin təfsirində buyurur ki, onlara evlərini məscidlərə döndərmək əmr edilmişdir.

İbn Kəsir isə bu ayəni belə izah edir: «Firon və tərəfdarları tərəfindən Musa və onun xalqına gələn bəlalar şiddətləndiyi zaman və onlar eyni düşmənlər tərəfindən sıxışdırıldıqda onlara çoxlu namaz qılmaları əmr edilmişdir. Belə ki, Allah-taala insanların bəlalara məruz qaldıqları zaman onlara namaz qılmalarını əmr edərək buyurur: **«Ey iman gətirənlər! Səbir və dua ilə** [*namazla*] **Allahdan kömək diləyin. Çünki Allah səbir edənlərlədir** [*onların dostudur*]**».**[24]

Bir hədisi-şərifdə isə Peyğəmbər ρ haqqında belə deyilir: *«Allahın elçisi hər hansı bir işdən dilxor olardısa, namaz qılardı».*[25]

Yuxarıda qeyd olunanlar insanın xüsusi ilə zəiflədiyi hallarda ibadətlərin evlərdə yerinə yetirilməsinin nə dərəcədə əhəmiyyətli olmasını açıq-aydın göstərir. Həmçinin bəzən müsəlmanlar elə vəziyyətlərə düşürlər ki, bu zaman onlar namazlarını düşmənlər önündə açıqcasına qılmaq imkanından məhrum olurlar. Gəlin bu cür vəziyyətlərdən söz düşmüşkən Məryəmin ibadət yeri olan mehrabını yadımıza salaq.

Bu barədə Allah-taala buyurur: **«…Zəkəriyya hər dəfə Məryəmin ibadət etdiyi mehraba girdikdə, onun yanında bir ruzi olduğunu görərdi».**[26]

Peyğəmbərin ρ səhabələri də (Allah onlardan razı olsun!) fərz namazları istisna olmaqla digər namazlarını daim evlərində

---

[23] Yunus, 87.
[24] əl-Bəqərə, 153.
[25] Təfsir İbn Kəsir, 4/224.
[26] Ali-İmran, 37.

qılmağa can atardılar. Bu barədə ibrətli bir hekayəni xatırlamaq lap yerinə düşərdi.

Mədinə əhalisindən olan Mahmud ibn Rəbiədən rəvayət olunur ki, Peyğəmbərin ρ səhabələrindən və Bədr döyüşünün iştirakçılarından olan mədinəli İtban ibn Malik τ Allah elçisinin hüzuruna gələrək dedi: «Ey Allahın elçisi! Mən öz tayfama namazda imamlıq edərkən gözlərim zəiflədi. Yağış yağarkən mənimlə onların məscidi arasında olan vadini apardıqdan sonra mən onların məscidinə gedib onlara namazda imamlıq edə bilmədim. Ey Allahın elçisi! İstərdim ki, sən bizim evə gəlib orada namaz qılasan ki, mən də evimi namaz qılınan bir yer olaraq qəbul edim». Allahın elçisi ρ: «Yaxşı, Allah qoysa, gələcəyəm» – deyə bu işə razılıq verdi. İtbanın dediyinə görə ertəsi gün Allahın elçisi ρ və Əbu Bəkr τ günortaya yaxın gəlib çıxdılar. Allahın elçisi içəri təşrif buyurmaq üçün izn istədi və mən bunun üçün ona izn verdim. O, içrəi girər-girməz əyləşməyərək soruşdu: «Sən evin harasında mənim namaz qılmağımı isitəyirsən?» Mən də evin müəyyən bir bucağını ona işarə etdim. Bundan sonra Allahın elçisi namaza durdu, təkbir etdi. Biz də ayağa qalxaraq cərgəyə dayandıq. Peyğəmbər ρ iki rükət namaz qılıb sonda da salam verdi.[27]

İbn Hacər əl-Əsqəlani (Allah ona rəhmət eləsin!) hədisin faydaları barədə belə buyurur:

Hədisdə ev daxilində müəyyən bir yerin namaz qılmaq üçün seçilməsinin caizliyi öz əksini tapmışdır. Məsciddə müəyyən bir yerin daim namaz qılmaq üçün götürülməsinin qadağan olunmasına gəldikdə, bu barədə Əbu Davudun rəvayət etdiyi hədisi sübut olaraq göstərmək olar. Bu hədisə görə məsciddə müəyyn bir yerin namazgah olaraq götürülməsi riyakarlığa, özünü nümayişə gətirib çıxarır. Lakin Əbu Davudun rəvayət etdiyi hədisdəki qadağanı məscid statusu almış evlərə belə şamil etmək olmaz.

## Nəsihət 5
## Ailə üzvlərinin iman baxımından tərbiyəsi

---

[27] Buxari (şərhlə birlikdə), 1/519.

Aişədən rəvayət olunur ki, τ Allahın elçisi gecənin bir hissəsi namaz qılar, vitr namazını qıldıqda isə: *«Ey Aişə, dur, sən də vitr namazını qıl»* – deyə məni də durquzardı.[28]

Allahın elçisi ρ buyurmuşdur: *«Allah-taala gecənin bir hissəsi namaz qılmaq üçün yuxudan duran və bu məqsədlə də yoldaşını yuxudan durquzan, yoldaşının buna etiraz etdiyi təqdirdə isə onun sifətinə su çiləyən kişidən öz mərhəmətini əskik etməsin!»*[29]

Qeyd olunmalıdır ki, ailədə qadınları sədəqə verməyə çağırış imanın dərəcəsinin qalxmasına səbəb olan amillərdəndir. Peyğəmbər ρ öz hədislərində də qadınları bu böyük xeyirxahlığa çağıraraq buyurur: *«Ey qadınlar! Sədəqə verin. Çünki mən Cəhənnəm əhlinin əksəriyyətinin sizlərdən olmasının şahidi olmuşam».*[30]

Evdə kasıblar və miskinlər üçün ianə qutusunun saxlanılması çox original və məqsədyönlü fikirlərdəndir. Bu qutuya daxil olan hər bir məbləğ isə ehtiyaclı insanların əmlakı hesab olunur. Əgər ailə üzvləri ailədə xoşbəxt və bəxtiyar günlərdə, həftənin bazar ertəsi və cüma axşamı günlərində, məhərrəm ayının doqquzunda, Aşura və Ərafa günlərində, məhərrəm və şaban aylarının bir çox günlərində oruc tutmaq kimi bir örnəyin şahidi olsalar, heç sözsüz ki, bu hal onları həmin örnəyi təqlid etməyə sövq edəcəkdir.

## Nəsihət 6
## Müəyyən zikrlər və evlərlə bağlı olan sünnələrə diqqət yetirmək

### *Mənzilə daxil olarkən oxunan zikrlər*

Müslim özünün «əs-Səhih» adlı hədislər toplusunda Allah elçisinin ρ belə deməsini rəvayət edir: *«İnsan mənzilə daxil olduqda və yeməyə başladıqda "Bismillah" demiş olsa, şeytan öz köməkçilərinə xitabən deyir: "Sizin burada nə gecələməyiniz, nə*

---
28 Müslim (şərhlə birlikdə) 6/23.
29 Əhməd, Əbu Davud, «Səhih əl-Cəmi», 3488.
30 Buxari (şərhlə birlikdə) 1/405.

*də yaşamağınız mümkündür”. Lakin insan mənzilinə “Bismillah” demədən daxil olsa, şeytan öz köməkçilərinə belə deyir: “Gecəni keçirə bilərsiz”. İnsan yeməyə də “Bismillah”sız başlamış olsa, şeytan yenə də öz köməkçilərinə xitabən: “Həm gecəni keçirmək, həm də yaşamaq imkanını əldə etdiniz” – deyər».*[31]

### *Mənzildən çıxarkən oxunan zikrlər*

Əbu Davud özünün «əs-Sünən» adlı hədislər toplusunda Allah elçisinin ρ aşağıdakı hədisini rəvayət edir: *«İnsan evdən çıxarkən: “Allahın adı ilə! Allaha təvəkkül etdim. Güc və qüdrət sahibi yalnız Allahdır!” – desə, ona belə deyərlər: “Bu sənin bəsindir! Artıq sənin yolun açıq, özün isə qorunursan”. Şeytan isə ondan əl çəkir. Başqa bir şeytan isə ona belə deyir: “Sən yolu açıq olan və qorunan insana nə edə bilərsən?»*[32]

### *Misvak*[33]

Müslim özünün «əs-Səhih» adlı hədislər toplusunda Aişənin τ belə deməsini rəvayət edir: *«Allahın elçisi ρ evə daxil olduğu zaman ilk olaraq dişlərini misvakla təmizləməyə başlardı».*[34]

## Nəsihət 7
## Şeytanı evdən qovmaq üçün orada əl-Bəqərə surəsinin davamlı qiraət edilməsi

Bu barədə bir neçə hədisi sizlərin nəzərinizə çatdıraq:

Allahın elçisi ρ buyurmuşdur: *«Evlərinizi qəbirstanlığa çevirməyin. Həqiqətən, şeytan əl-Bəqərə surəsinin oxunduğu evdən qorxub qaçar».*[35]

---

31 Müslim, 3/1599, Əhməd, 3/346.
32 Əbu Davud, 5095; Tirmizi, 3426; «əs-Sahih əl-Cəmi», 499.
33 Diş təmizləmək üçün iqlimi isti olan ölkələrdə bitən kol.
34 Müslim, kitabu ət-Tahara, 15/44.
35 Müslim, 1/539.

Allahın elçisim ρ buyurmuşdur: *«Evlərinizdə əl-Bəqərə surəsini oxuyun. Həqiqətən, şeytan əl-Bəqərə surəsinin oxunduğu evə daxil olmaz».*[36]

əl-Bəqərə surəsinin son iki ayəsinin fəziləti və bu ayələrin evdə oxunuşunun təsiri haqda Peyğəmbər ρ qüdsi hədislərinin birində belə buyurur: *«Hələ Allah-taala səmaları və yeri yaratmamışdan iki min əvvəl bir kitab yazmış və onu Ərşdə yerləşdirmişdir. Allah bu kitabdan iki ayə nazil etmiş və bu ayələrlə də əl-Bəqərə surəsini xətm etmişdir. Bu ayələr üç gecə evdə oxunmazsa, şeytan dərhal həmin evə yaxınlaşar».*[37]

## AİLƏDƏ ŞƏRİƏT ELMİ

### Nəsihət 8

### Ailə üzvlərinin maarifləndirilməsi

Aşağıdakı ayədə göstərilən əmri yerinə yetirmək hər bir ailə başçısının öhdəsinə düşən vəzifədir. Belə ki, ayədə deyilir: **«Ey iman gətirənlər! Özünüzü və əhli-əyalınızı elə bir oddan qoruyun ki, onun yanacağı insanlar və daşlar** [*daşdan düzəlmiş bütlər*]**, xidmətçiləri isə Allahın onlara verdiyi əmrlərə asi olmayan, buyurulduqlarını yerinə yetirən daş qəlbli** [*heç kəsə zərrəcə rəhm etməyən*] **və çox sərt təbiətli mələklərdir** [*zəbanilərdir*]**».**[38]

Bu ayə ailə üzvlərinin maarifləndirilməsi, tərbiyələndirilməsi, onlara yaxşılıqları əmr, pislikləri isə qadağan etmək üçün əsas bir amildir. Əziz oxucu, ailə başçısının öhdəsinə düşən vacibatlarla əlaqədar olaraq bu ayə barəsində bəzi təfsirçilərin fikirlərini sizlərə təqdim etməyi özümə borc bildim.

Qətada deyir: «Bu ayədə müminlərə Allaha ibadət və itaət etmək, qadağalardan isə çəkinmək əmr olunur. Həmçinin bu

---

[36] Hakim, «Mustədrək», 1/561; «əs-Sahih əl-Cəmi», 1170.

[37] Əhməd, «əs-Sünnə», 4/274 və başqaları; «əs-Sahih əl-Cəmi», 1799.

[38] ət-Təhrim, 6.

ayədə möminlərin öz ailələrini Allahın əmrini yerinə yetirməyə sövq etmək və bu işdə onlara öz yardımını əsirgəməmək kimi öhdəliklər öz əksini tapmışdır. Müsəlman olan kəs öz ailəsinin Allah tərəfindən qoyulan hər hansı bir qadağını pozduğunu görsə, dərhal onları bu yoldan sapındırmalı və qorumalıdır».[39]

əd-Dəhhak və Müqatil isə belə deyir: «Müsəlmanın öhdəsində olan qohum və kənizlərinə Allahın əmr və qadağalarını başa salması onun boynundakı bir vacibatdır».[40]

İmam Əli τ deyir: «Ailələrinizi maarifləndirin və tərbiyələndirin». [41]

ət-Tabari deyir: «Övladlarımızı və həyat yoldaşlarımızı maarifləndirmək, onlara ədəb-ərkan qaydalarını öyrətmək bizim üzərimizə düşən vacibatlardandır.

Əgər Allahın elçisi ρ insanları kənizlərini qul olduqları halda maarifləndirməyə sövq edirdisə, onda insanın azad (kölə olmayan) övladlarının və zövcələrinin maarifləndirilməsi haqqında danışmağa ehtiyac qalmır».

Buxari (Allah ona rəhmət eləsin!) özünün «əs-Səhih» adlı hədislər toplusunda – Kişinin kənizini və ailəsini maarifləndirməsi – adlı fəsildə belə bir hədisi rəvayət edir. Peyğəmbər ρ buyurmuşdur: *«Üç qrup insan vardır ki, onlar iki qat savabla mükafatlandırılır. Birincisi, əhli-kitabdan olan, həm öz peyğəmbərinə, həm də Məhəmmədə ρ iman gətirən şəxs, ikincisi, Allahın və öz ağalarının haqqını ödəyən kölə, üçüncüsü də kənizini gözəl şəkildə tərbiyələndirən, maarifləndirən, sonra isə onu köləlikdən azad edərək ərə verən kişi».*

İbn Hacər (Allah ona rəhmət eləsin!) hədisin şərhi barədə deyir: «Hədisin mətnində kənizin maarifləndirilməsi qeyd olunsa da, müqayisədə bu ailənin maarifləndirilməsinə də şamil olunur. Belə olan halda insanın öz azad ailə üzvlərinə Allahın vacibatlarını və Peyğəmbərin ρ sünnələrini öyrənməkdə xidmət etməsi kənizlərinə xidmət etməsindən daha məqsədyönlüdür».[42]

---

39 ət-Tabari, 28/166.

40 Təfsir İbn Kəsir, 8/194.

41 Zəd əl-Məsir, 8/312.

42 Buxari (şərhlə birlikdə), 1/190.

Bəzən insan işlərinin, vəzifəsinin və əlaqələrinin çoxluğundan özünü ailəsinin təlim-tərbiyə işlərinə həsr etmək imkanından məhrum olur. Bu problemi çözmək üçün isə insan istənilən bir günü öz ailəsinə həsr etməsi üçün müəyyənləşdirməlidir. Hətta o bu gündə evində elm məclisi təşkil etmək üçün öz qohumlarını da dəvət edə bilər. Ailə başçısı bu günü hamıya elan edir. Bununla da hamının bu gündə evdə olması məsələsi nizama salınır. Hər kəsin çöhrəsində bu günün gəlişi münasibəti ilə ruh yüksəkliyinin cizgiləri görünməyə başlayır. Beləliklə təyin olunmuş gündə ailə başçısı da başda olmaqla hər kəsin yığışması bir zərurətə çevrilir. Əziz oxucu, bu mövzuda Peyğəmbərin ρ əməl etdiyi bir hədisi sənə təqdim edirik.

Buxarinin (Allah ona rəhmət eləsin!) özünün «əs-Səhih» adlı hədislər toplusunda Əbu Səid əl-Xudridən τ rəvayət etdiyi hədisdə belə deyilir: Qadınlar Peyğəmbərə ρ şikayətlənərək: «Sən kişilərə çox vaxt ayırırsan. Günlərinin birini də bizim üçün təyin et» – dedilər. Bunun cavabında da Allahın elçisi ρ bir günü onlara vəd etdi. Həmin gün gəldikdə o, qadınlarla görüşdü, onlara nəsihətlər etdi, əmrlər verdi.

İbn Hacərin dediyinə görə Səhl ibn Əbu Saleh atasından, o da Əbu Hüreyrədən τ yuxarıdakı rəvayətə bənzər bir hədisi rəvayət etmişdir. Rəvayətdə deyilir ki, Peyğəmbər ρ qadınlara: *«Görüş yeriniz filankəsin evindədir»* – demiş və həmin evə gələrək onlarla söhbət etmişdir.[43]

Hədisdən də göründüyü kimi burada qadınların maarifləndirilməsi evlərdə baş verir, səhabələrin qadınlarının biliyə göstərdikləri canfəşanlıq, həvəs hədisdə öz əksini tapır. Bir amili də qeyd etmək lazımdır ki, maarifləndirmədə bütün qüvvənin yalnız kişilərə sərf edilməsi və ancaq onların hədəfə alınması təbliğatçılar və ailə başçıları tərəfindən buraxılan ciddi bir nöqsandır.

Hərdən bəzi oxucularımız şikayətlənərək: «Tutaq ki, biz istənilən bir günü seçib təyin etdik və bu barədə ailə üzvlərimizə xəbər verdik. Yaxşı, onda biz bu ailə toplantılarında nədən danışaq, necə başlayaq?»

---

[43] Buxari (şərhlə birlikdə), 1/195

Əziz oxucu! Bu sualın cavabı olaraq sənə ümumiyyətlə ailə üzvlərinin, xüsusən də qadınların tədirisi üçün çox sadə və bəsit bir metod təklif edirəm. Bu metod aşağıda sadalayacağım əsərlər əsasında öz tədrisini təşkil etməkdir.

1. Böyük alim Əbdürrəhman Nasir əs-Sədinin **«Təysiru-l-Kərimi-r-Rəhman fi təfsiri kələmi-l-mənnam»** (Müqəddəs Quranın təfsiri) adlı əsəri. Əsər yeddi müfəssəl cildən ibarətdir. Bu kitabdan müəyyən surələrin və ya surələrdən bəzi parçaların təfsirləri haqda oxumaq və bu barədə ətrafındakıları maarifləndirmək məqsədyönlü bir addımdır.

2. **«Riyadu-s-salihin»** (Salehlər bağçası) adlı hədislər toplusundan bəzi hədislər oxuyaraq onlar barəsində müəyyən izahatlar, nəsihətlər vermək, dəyərli və ibrətamiz məlumatlarla bəhrələnmək, həmçinin bu barədə **«Nuzhətul-müttəqiin»** (Müttəqilərin gəzintisi) adlı kitaba müraciət etmək atılan məqsədyönlü addımlardandır.

3. Bu xüsusda alim Siddiq Həsən Xanın «Qadınlar barəsində Allah və Onun elçisindən nəql olunan örnəyin gözəlliyi» adlı əsərindən də bəhrələnmək mümkündür.

Həmçinin qadınları təharət, təbii qanlar, namaz, zəkat, oruc, həcc kimi bəzi dini ayinlərin qayda-qanunları barədə maarifləndirmək, bunu bacardıqları təqdirdə isə onlara yemək-içməyin, geyimin, zinətin, fitrət və məhrəm sünnələrinin, musiqinin, rəsm çəkməyin və digər məsələlərin fiqhi hökmlərini başa salmaq lazımdır. Bu barədə bir çox elm və din xadimlərinin, o cümlədən Şeyx Əbdüləziz ibn Baz, Şeyx Məhəmməd ibn Saleh əl-Üseymin kimi din xadimlərinin istər kitab şəklində, istərsə də lent yazılarına köçürülmüş fitvalarından mühim mənbələr kimi istifadə etmək daha məqsədəuyğun olardı.

Qadının və ailə üzvlərinin təlim proqramına təlim üçün çeşidli və mötəbər qaynaqların əldə edilməsi məqsədilə onları gedə biləcəkləri mötəbər alim və elm tələbələrinin mühazirələri və dərsləri ilə qidalandırmaq da aiddir. Bu sahədə Qurani-Kərim “radiosunun” bir çox proqramını dinləmək və diqqəti bu istiqamətə yönəltmək unudulmamalıdır. Həmçinin təlim proqramına təyin olunmuş xüsusi günlərdə qadınları dini şərtlərə uyğun olaraq kitab sərgilərinə aparmaq da daxildir.

## Nəsihət 9
## Evində islam kitabxanasının toxumlarını yarat

Ailə üzvlərinin maarifləndirilməsinə, onların dini əhkamlara yaxından bələd olmalarına imkan yaradan və bu əhkamların yerinə yetirilməsində onlara yardım edən amillərdən biri də evdə dini kitabxananın fəaliyyət göstərməsidir. Lakin bu kitabxananın böyük olması bir o qədər də vacib deyil, zəruri olan mühüm kitabları seçmək, onların hər vaxt ələ alınmasını asanlaşdıracaq bir yerə qoymaq və ailə üzvlərini bu kitabları oxumağa sövq etməkdir.

Kitabxananı evin içəri salonunda təmiz və səliqəli bir küncdə, yataq otağında, yaxud qonaq otağında kitab üçün münasib bir yerdə yerləşdirmək lazımdır ki, hər kəsin evdə mütəmadi olaraq bu kitabların oxunuşu üçün imkanı olsun. Kitabxananı elə bir ustalıqla qurmaq lazımdır ki, bu kitabxana müxtəlif məsələlərin tədqiqatında istifadə edilən yararlı mənbələri əhatə edə bilsin, övladlar məktəbdə bu kitablardan yararlana bilsin. Həmçinin bu kitabxana müxtəlif səviyyəli insanlara – yaşlılara, azyaşlılara, kişilərə və qadınlara məxsus kitablarla zəngin olmalıdır. Yaxşı olardı ki, belə kitabxanalarda qonaqlara, uşaqların dostlarına, ailəni ziyarətə gələnlərə hədiyyə etmək üçün nəfis tərtibatlı və tədiq olunmuş hədis kitabları da olsun. Evdə kitabxana təşkil etmək üçün kitabşünas məsləhətindən sonra kitab sərgisindən də istifadə etmək olar. Kitabları asanlıqla tapmaq üçün kitabxananın mövzulara görə tərtibatı gərəkdir. Məsələn, təfsir kitablarını bir rəfə, hədis toplularını başqa bir rəfə, fiqhə aid kitabları üçüncü rəfə və digər kitabları bu minvalla düzmək lazımdır. Belə olan halda ailə üzvlərindən biri lazımi kitabları asanlıqla tapmaq üçün əlifba sırası və mövzuların ardıcıllığı ilə yerləşdirilmiş mündəricatın köməyindən istifadə edir. Bəzən kitab həvəskarları ailə kitabxanası üçün lazım olan dini ədəbiyyatların adları barəsində bir-birilərindən soruşurlar. Əziz oxucu, bu səbəbdən də bəzi lazımi ədəbiyyatların siyahısını sizə təqdim edirik.

***Quranın təfsirinə dair ədəbiyyatlar:*** İbn Kəsirin təfsir kitabı, İbn Sədinin təfsir kitabı, əl-Əşqarın **"Zubdətut-təfsir"** adlı əsəri, İbn əl-Qeyyimin **"Bədəiut-təfsir"** adlı əsəri, İbn əl-Üseyminin **"Usulut-təfsir"** adlı əsəri, Məhəmməd əs-Səbağın müəllifliyi ilə **"Ləməhat fii ulumil-quran"** əsəri və s.

***Hədis elminə aid ədəbiyyatlar:*** **"Səhihul-kəlimit-teyyib"** əsəri, **"Aməlul-muslimi fil-yaumi val-leyləti"** yaxud **"əs-Səhihul-musnəd min əzkəril-yaumi val-leyləti"** adlı əsər, **"Riyadus-salihin"** və ona yazılmış **"Nuzhətul-muttəqin"** adlı şərh, Zübeydinin müəllifliyi ilə **"Muxtəsərus-səhihil-buxari"** əsəri, Munzirinin və əl-Albaninin müəllifliyi ilə **"Muxtəsərus-səhihil-muslim"** əsəri, **"Səhihul-camiis-sağir"** və **"Daiiful-camiis-sağir"** əsərləri, **"Səhihut-tərğib vat-tərhib"** əsəri, **"əs-Sunnətu va məkənətuhə fit-təşri"** əsəri, Nazim Sultanın **"Qavaid va fəvaid minəl-ərbəiinən-nəvəviyyəti"** adlı əsəri və s.

***Əqidəyə dair ədəbiyyatlar:*** Tövhid kitabına yazılmış **"Fəthul-məcid"** adlı şərh, Həkminin **"Ə`ləəmus-sunnətil-mənşurəti"** və **"Məaricul-qubul"** adlı əsərləri, əl-Albaninin tədqiqatı ilə **"Şərhul-əqidətit-tahaviyyəti"** adlı əsər, Ömər Süleyman əl-Əşqarın 8 bölümlük **"Silsilətul-əqidəti"** adlı əsəri, dok. Yusif əl-Vabilin **"Əşrətus-saəti"** adlı əsəri və s.

***Fiqh elminə dair:*** İbn Doyanın **"Mənərus-səbil"**, əl-Albaninin isə **"İrvaul-ğəlil"** adlı əsərləri, İbn əl-Qeyyimin **"Zədul-məad"** adlı əsəri, İbn Qudamənin **"əl-Muğni"** adlı əsəri, **"Fiqhus-sunnəti"** adlı əsər, Saleh əl-Fauzənin **"əl-Muləxxisul-fiqhiyyu"** adlı əsəri, Əbdüləziz ibn Bazın, Məhəmməd ibn Saleh əl-Üseyminin və Abdullah ibn Cibrinin müəlifliyi ilə **"Məcmuətu fətavəl-uləməi"** adlı fitvalar toplusu, şeyx əl-Albaninin və şeyx Əbdüləziz ibn Bazın **"Sıfətus-salətin-nəbiyyi"** adlı əsərləri, əl-Albaninin **"Muxtəsər əhkəmil-cənəiz"** adlı əsəri və s.

***Əxlaq mövzularına dair ədəbiyyatlar:*** **"Təhzib mədaricus-salikin"** əsəri, **"əl-Fəvaid"** əsəri, **"əl-Cəvəbul-kəfi"** əsəri, **"Tariqul-hicrəteyni va bəbus-səadəteyni"** əsəri, İbn əl-Qeyyimin müəllifliyi ilə **"əl-Vabilus-seyyib va rafiul-kəlimit-teyyib"** adlı əsər, İbn Rəcəbin **"Lataiful-məarif"** adlı əsəri,

**“Təhzib moizətil-muminin”** əsəri və **“Ğizəul-əlbab”** adlı əsər və s.

***Həyat və yaradıcılığa dair ədəbiyyatlar:*** İbn Kəsirin **“əl-Bidəyətu van-nihəyətu”** adlı əsəri, Tirmizinin müəllifliyi, əl-Albaninin isə ixtisarı ilə **“Muxtəsərul-şəməilil-muhəmmədiyyə”** adlı əsər, əl-Mubarakfurinin həzrəti Peyğəmbərin ρ həyatına dair **“ər-Rahiiqul-məxtum”** əsəri, İbn əl-Ərəbinin **“əl-Avasim minəl-qavasim”** adlı əsəri, şeyx Əkrəm əl-Ömrinin **“əl-Muctəməul-mədəniyyu 1-2”** əsəri, **“Siyəru ə`ləmin-nubələ”** adlı əsər, Məhəmməd ibn Samil əs-Silminin **“Mənhəcu kitəbətit-tərixil-isləmiyyi”** adlı əsəri və s.

Həmçinin müxtəlif sahələrə dair bir neçə mötəbər ədəbiyyatlar vardır ki, bunların bəzilərinin siyahısını sizə təqdim edirik:

Şeyx Məhəmməd ibn Əbdülvəhhabın əsərləri, Böyük alim, şeyx Əbdürrəhman ibn Nasir əs-Sədinin əsərləri, şeyx Ömər ibn Süleyman əl-Əşqarın əsərləri, şeyx Məhəmməd ibn Əhməd ibn İsmayıl əl-Müqəddimin əsərləri, Məhəmməd Məhəmməd Hüseynin əsərləri, şeyx Məhəmməd Cəmil Ziynunun əsərləri, Məhəmməd Nəim Yasinin **“Kitabul-iman”** adlı əsəri, Məhəmməd Səid əl-Qəhtaninin **“əl-Vələu val-bərəu”** adlı əsəri, Əli ibn Bəxit əz-Zəhraninin **“İnhirafatul-aqadiyyətu fil-qarneynis-səniyə aşara vas-səlisə aşara”** adlı əsəri, Abdullah əş-Şəbanənin **“əl-Muslimunə va zahirətul-həziymətin-nəfsiyyə”** adlı əsəri, Mustafa əs-Səbainin **“əl-Mər`ətu beynəl-fiqhi val-qanun”** adlı əsəri, Mərvan Kocaqın **“əl-Usrətul-muslimətu əməməl-fidyu vat-tilfizyun”** adlı əsəri, Əhməd Əbabtinin **“əl-Mər`ətul-muslimətu i`dəduhə va məs`uliyyətuhə”** adlı əsəri, Adnan Baharasın **“Məs`uliyyətul-əbul-muslimi fii tərbiyəti validihi”** adlı əsəri, Əhməd Bərazinin **“Hicəbul-muslimәti”** adlı əsəri, Abdullah Məhəmməd Ğəribin **“Kitəb va cəə` daurul-məcus”** adlı əsəri, Şeyx Bəkr Əbu Zeydin əsərləri, Məşhur Həsən Salmanın tədqiqatları və s.

Bunlardan başqa hələ adını çəkmədiyimiz çoxlu faydalı ədəbiyyatlar mövcuddur. Bu da yuxarıda misal olaraq adlarını çəkdiyimiz ədəbiyyatlarla məhdudlaşmır. Bunlardan əlavə olaraq saysız dərəcədə də faydalı kitabçalar vardır ki, onları sadalamaq istəsək, bunun üzərində uzun-uzadı qalmalı olacağıq.

Ümumiyyətlə müsəlman ədəbiyyat seçərkən məsləhət almalı və bu barədə son dərəcə diqqətli olmalıdır. Allah-taala kimə xeyr istəsə, onu dində fəqih (dini yaxşı bilən) edər.

## Nəsihət 10
## Evdə audiotekanın olması

Hər bir evdə maqnitofonun olması həm yaxşı, həm də pis vərdişlərin yaranmasına gətirib çıxara bilər. Ondan necə istifadə edək ki, Allahın razılığını qazana bilək?

Evdəki audioteka alimlərin, qarilərin xatiblərin və moizəçilərin ən yaxşı dini audio kasetlərindən ibarət olmalıdır. Həqiqətən, evdə bəzi qarilərin səslərinə yazılmış quran kasetlərini dinləməyin istər Quranın mənasını başa düşmək nöqteyi-nəzərdən, istərsə də eşitdiklərini təkrar edərək əzbərləmək baxımından ailə üzvlərinə böyük təsiri vardır. Bunun faydalarından biri də odur ki, ailə üzvləri müntəzəm olaraq Quranı dinləməklə mahnı və bəstələr kimi şeytani səslərdən özlərini qorumuş olur. Çünki qulaq və qəlb Allah kəlamı ilə şeytani səslərin bir-birinə qarışdığı bir məkanda qətiyyən islah ola bilməz.

Ailə üzvlərinin gündəlik həyatlarında rast gəldikləri müxtəlif dini əhkamlar sayəsində dini yaxşı başa düşmələrinə təsir göstərən neçə-neçə fitvalar kaseti vardır ki, bu sahədə də Şeyx Əbdüləziz ibn Baz, Şeyx Məhəmməd Nasiriddin əl-Əlbani, Şeyx Məhəmməd əl-Üseymin, Şeyx Saleh əl-Fövzan və digər həm elm, həm də din sahələrində özünəməxsus yeri olan və elm əhlinin inam və etibarını qazanmış alimlərin lentə alınmış fitvalarını dinləmək məsləhət görülür.

Müsəlmanlar gərək fitva almaq məsələsində diqqətli olsunlar. Çünki bu dindir. Dininizi kimdən götürdüyünüzə isə fikir verin! Əməlisalehliyi, təqvası, möminliyi, səhih hədislərə istinad etməsi, məzhəb təəssübkeşliyinin olmaması, davranışının sübutlara əsaslanması, orta yolun yolçusu olması ilə tanınan, dini həm çətinləşdirmədən, həm də asanlaşdırmadan ona xidmət edən insandan dini götürmək, fitva istəmək lazımdır. Allah-taala Quranda da soruşarkən biləndən soruşmağın zəruriliyini qeyd

edərək buyurur: **«O, göyləri, yeri və onların arasındakıları altı günə xəlq edən, sonra ərşi yaradıb ona hakim olan Rəhmandır. Bunu bir biləndən xəbər al!»**[44]

Xalqın maarifləndirilməsinə və şüurlandırılmasına xidmət edən, dəlillər gətirən, günahlardan çəkindirən moizəçilərə qulaq asmaq müsəlman ailəsindəki fərdin şəxsiyyətinin yaranmasında və formalaşmasında mühüm rol oynayır.

Kasetlər, lent yazıları saysız dərəcədə boldur. Moizəçilər də çoxdur. Lakin ən mühümü odur ki, müsəlman mühazirəçinin, moizəçinin doğru yolda olmasını göstərən əlamətlərə bələd olsun ki, onun lent yazılarını dinləməyə can atsın və bunda da özündə arxayınlıq tapsın. Bu əlamətlərdən bəzilərini sizin diqqətinizə çatdırmaq istərdik.

1. Xilaskar firqə olan «Sünnə əhli və camaat» firqəsinin əqidəsini daşımalı, Sünnəni lazım bilməli, bidətləri isə rədd etməlidir. Orta yolu əsas götürməli, dində nə mübaliğəyə yol verməli, nə də dini hədsiz dərəcədə asanlaşdırmamalıdır.

2. Səhih hədislərə əsaslanmalı, zəif və *mövdu* (qondarma) hədislərdən isə daim çəkinməlidir.

3. İnsanların halını və xalqın yaşadığı vəziyyəti görməyi, dərk etməyi, dərdə dəva tapmağı bacarmalıdır. Həmçinin insanlara faydası toxuna biləcək və onların ehtiyac duyduqları şeyləri təqdim etməlidir.

4. Bacardığı qədər haqqı söyləməli, batil və boş-boş söhbətlər etməməli və insanları Allahın qəzəbinə gələn işlərlə razı salmamalıdır.

Neçə-neçə kasetlərin istər gənc qaridən eşidərək çox saylı surələrin əzbərlənməsi baxımından, istərsə də gündüz və gecə oxunulan zikrlərin, islam ədəb qaydalarının və məqsədəuyğun nəğmələrin yadda saxlanılması nöqteyi-nəzərdən azyaşlılara olan təsirinin şahidi olmuşuq.

Kasetlərin tərtibatla siyirtmə qutulara qoyulması bir tərəfdən onu tez əldə etməyi asanlaşdırır, digər tərəfdən isə onları körpələrin ayağı altında qalaraq sınmasından, xarab olmasından qoruyur. Həmçinin maraqlı audio kasetləri dinlədikdən sonra

---

[44] əl-Furqan, 59.

onun ya hədiyyə, ya da borc olaraq başqalarına verilməsinə çalışmalıyıq. Qeyd edilməlidir ki, maqnitofonun mətbəxdə olmasının evdar qadına da çox böyük faydası vardır. Həmçinin onun yataq otağında saxlanılması da vaxtdan yararlanmağa kömək edir.

### Nəsihət 11
### Əməlisalehlərin, xeyirxah insanların və elm tələbəlrinin evə dəvət olunması

Allah-taala Qurani-Kərimdə buyurur: **«Ey Rəbbim! Məni, ata-anamı, mənim evimə** [*yaxud məscidimə*] **mö'min kimi daxil olan kimsəni və** [*Qiyamət gününə qədər olacaq*] **bütün mö'min kişiləri və qadınları bağışla. Zalimlərin isə ancaq həlakını artır!»**[45]

Şübhəsiz ki, iman əhlinin sənin evinə daxil olması evinin nurunu artırar. Onlarla həmsöhbət olmaq, müəyyən məsələləri onlarla birgə müzakirə etmək çoxlu faydalı ünsürlərin əldə edilməsinə gətirib çıxarır. Üstündə müşk-ənbər gəzdirən ya onu sənə hədiyyə edəcək, ya sən onu satın alacaqsan, ya da onun xoş rayihəsini qoxlayacaqsan. Ailədə oğlan uşaqlarının, atanın bu məclisdə iştirak etməsi, qadınların isə pərdə arxasından söhbətləri dinləməsi hamı üçün bir tərbiyədir. Əgər xeyri daxil etmiş olsan, şərin daxil olmasına və bərbad etməsinə mane olmuş olarsan.

## Nəsihət 12
### Evlərə dair dini əhkamların öyrənilməsi

***Evdə namaz qılmaq:***

Peyğəmbər ρ kişilərin namazı barədə buyurur: *«Namazların ən əfzəli kişinin fərz namazları istisna olmaqla evdə qıldığı namazdır».*[46]

---

[45] Nuh, 28.
[46] Əbu Davud, «əs-Sahih əl-Cəmi», 2749.

Kişinin fərz namazlarını üzürlü hallar istisna olmaqla məsciddə qılması vacibdir. Allahın elçisi ρ yenə də buyurur: *«Kişinin camaatla qıldığı namazı tək qıldığı namazdan əfzəl olduğu kimi, onun evində qıldığı nafilə namazı da camaat arasında qıldığı nafilə namazlarından daha üstündür».*[47]

Qadınlara gəldikdə isə onların namaz qıldıqları yer nə qədər dərinlikdə olsa, bir o qədər yaxşıdır. Bu barədə Allahın elçisi ρ buyurur: *«Qadınların ən xeyirli namazı evlərinin dərinliyində qıldıqları namazdır».*[48]

Evdə kənar adam ev sahibinin izni olmadan imamlıq etməməli və onun yerində əyləşməməlidir. Bu barədə Allahın elçisi ρ buyurur: *«İnsanın səlahiyyəti çatdığı yerdə (evində) iznsiz olaraq heç kəs imamlıq etməsin və heç kəsin evində icazəsiz başda əyləşilməsin».*[49]

Hədisdən də göründüyü kimi insanın öz mülkündə və ya səlahiyyəti çatdığı bir yerdə başqası ondan daha çox Quran bildiyi halda belə imam durmamalıdır. Çünki o səlahiyyəti çatdığı yerdə ev sahibinin, yaxud məscid imamının daşıdığı səlahiyyətləri daşıyır. Həmçinin heç kəsə ev sahibinə məxsus döşəkdə və ya çarpayıda iznsiz əyləşmək caiz deyildir.

Allah-taala Qurani-Kərimdə bu barədə buyurur: **«Ey iman gətirənlər! Başqalarının evlərinə** [*sizin olmayan evlərə*] **sahiblərindən icazə almadan və onlara salam vermədən girməyin. Bu** [*ədəb-ərkan baxımından*] **sizin üçün daha yaxşıdır. Bəlkə,** [*Allahın bu əmrinin hikmətini*] **düşünüb anlayasınız** [*və həmişə yadda saxlayıb ona əməl edəsiniz*]**. Əgər orada heç kəsi tapmasanız, sizə icazə verilməyənədək içəri girməyin. Sizə: "Geri dönün!" – deyilsə, geri dönün. Bu, Allah yanında sizin üçün daha yaxşıdır. Allah nə etdiklərinizi bilir!»**[50].

Digər bir ayədə isə belə deyilir: **«Evlərə qapılarından daxil olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!»**[51]**.**

---

47 İbn Əbu Şeybə; «əs-Sahih əl-Cəmi», 2953.
48 Təbərani, «əs-Sahih əl-Cəmi», 3311.
49 Tirmizi, hədis 2772; «əş-Şərh fi tuhfətu əl-əhvaz», 8/56.
50 ən-Nur, 27-28.
51 əl-Bəqərə, 189.

İçərisində heç kəsin olmadığı evlərə icazəsiz daxil olmaq caizdir. Əgər həmin evdə daxil olan şəxsin əşyası vardırsa, onda bu qonaq evləri kimidir. Bu barədə Quranda belə deyilir: **«İçərisində əşyanız** [*karvansara, mehmanxana, ümumi istifadə yerləri kimi*] **qeyri-məskun evlərə** [*icazəsiz*] **daxil olmaq sizin üçün günah deyildir. Allah üzə çıxartdıqlarınızın və gizlətdiklərinizin hamısını bilir».**[52]

Qeyd etmək lazımdır ki, insanın qohum-əqrabalarının, dostlarının evlərində, həmçinin açarları əllərində olan (səlahiyyəti çatan) başqalarına məxsus evlərdə onların razılıqları ilə yemək yeməsində heç bir günah yoxdur. bu barədə Allah-taala Quranda belə buyurur: **«Kora, çolağa, xəstəyə** [*başqaları ilə bir yerdə oturub yemək yeməkdə*] **günah yoxdur. Sizin özünüzə də öz evlərinizdə, yaxud atalarınızın evlərində, yaxud analarınızın evlərində, yaxud qardaşlarınızın evlərində, yaxud bacılarınızın evlərində, yaxud əmilərinizin evlərində, yaxud bibilərinizin evlərində, yaxud dayılarınızın evlərində, yaxud xalalarınızın evlərində, yaxud açarları əllərinizdə olan** [*səlahiyyətiniz çatan*] **evlərdə, yaxud dostlarınızın evlərində yemək yeməkdən heç bir günah gəlməz. Bir yerdə, yaxud ayrı-ayrılıqda yeməyinizdə də heç bir günah yoxdur».**[53]

Evdə uşaqlara, xidmətçilərə tapşırılmalıdır ki, adi yatmaq vaxtlarında icazəsiz olaraq valideynlərin yataq otağına ehtiyatsızlıq edib keçməsinlər. Bu vaxtlar isə aşağıdakılardır: sübh namazından əvvəl, günorta istirahət vaxtı və gecə namazından sonra. Çünki bu zaman onların gözləri münasib olmayan görüntülərə sataşa bilər. Əgər onlar qalan vaxtlarda təsadüfən münasib olmayan nə isə bir şey görmüş olsalar, bunun üçün onlara günah yazılmaz. Çünki onlar evdə maneəsiz gəzənlərdəndirlər. Bu barədə Allah-taala Quranda buyurur:

**«Ey iman gətirənlər! Sahib olduğunuz kölə və kənizlər, həddi-buluğa çatmayanlar** [*yanınıza daxil olmaq istədikdə*] **bu üç vaxtda sizdən icazə alsınlar: sübh namazından əvvəl; günorta** [*yatıb dincəlmək, istirahət etmək üçün*] **paltarınızı çıxartdığınız zaman və gecə namazından sonra.** [*Bu vaxtlar*

[52] ən-Nur, 29/
[53] ən-Nur, 61.

*insan paltarını çıxarda bilər, zövcəsi ilə bir yerdə uzanıb ixtilat edə bilər və i.a.*]. **Bu üç vaxt sizin üçün xəlvət vaxtdır** [*paltarsız ola bilərsiniz*]. **Qalan vaxtlarda bir-birinizin yanına** [*icazəsiz*] **girib çıxmaqda sizə də, onlara da heç bir günah yoxdur. Allah öz ayələrini sizə belə izah edir. Allah** [*hər şeyi*] **biləndir və hikmət sahibidir!»**[54]

Allahın elçisi ρ başqaların evinə iznsiz olaraq baxmağın qadağan olunması barədə belə deyir: *«Kim camaatın evinə iznsiz olaraq baxdığı zaman camaat onun gözünü tökmüş olsa, buna görə onun nə qanbahası, nə də qisas almaq hüququ yoxdur».*[55]

Boşanılmış qadının gözləmə müddəti (iddət) boyunca evindən çıxmaması və çıxarılmaması, həmçinin bu müddətdə ona maddi cəhətdən himayə edilməsi barədə Allah-taala buyurur: **«**[*Ya Peyğəmbər!*] **Övrətləri boşadığınız zaman onları gözləmə müddətlərində** [*heyzdən pak olduqdan sonra*] **boşayın. Gözləmə müddətini** [*iddəti*] **sayın. Rəbbiniz olan Allahdan qorxun. Onları – açıq-aşkar bir pis iş** [*zina*] **etməyənə qədər –** [*gözləmə müddəti qurtarmamış yaşadıqları evlərdən*] **çıxartmayın və onlar özləri də çıxmasınlar. Bu, Allahın hüdudlarıdır** [*hökmləridir*]. **Allahın müəyyən etdiyi hüdudları aşan kimsə özünə zülm etmiş olar. Nə bilirsən, ola bilsin ki, Allah bundan sonra bir iş icad etsin** [*ərin ürəyinə yenidən zövcəsinin məhəbbətini salsın və onlar barışsınlar*]**».**[56]

Evdə və evdən kənarda kişinin deyingən və tərs olan arvadından qanuni şəkildə ayrılmasının caizliyi: kişinin ev daxilində arvadından ayrılması barədə Quranda Allah-taala belə buyurur: **«**[*Ey kişilər!*] **Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin,** [*yola gəlməzlərsə*] **onlardan yatağınızı ayırın…».**[57]

Evdən kənarda kişinin qadınından ayrılmasına gəldikdə isə Allahın elçisi ρ qadınların otağını ayırdığı zaman özü onların evinin xaricində yüksək, yuxarı bir otağa çəkildi.[58]

---

[54] ən-Nur, 58.
[55] Əhməd, Müsnəd 2/385; «əs-Sahih əl-Cəmi», 6046.
[56] ət-Talaq, 1.
[57] ən-Nisa, 34.
[58] Buxari.

Qeyd etmək lazımdır ki, evdə tək gecələmək qadağan olunmuşdur. Bu barədə İbn Ömərdən τ nəql olunan rəvayətə görə Peyğəmbər ρ tək gecələməyi və tək səfərə çıxmağı qadağan etmişdir.[59] Evdə tək qalmaq tənhalıqla, insanlardan təcrid olmaqla, düşmən və oğruların basqınına məruz qalmaq, o cümlədən xəstəliyə tutulmaq kimi bəlalarla nəticələndiyi üçün Allah elçisi ρ tərəfindən qadağan olunmuşudur. Əgər insanın yanında hər hansı bir dostu, yoldaşı olarsa, onu düşmən və quldurların tamahkarlığından müdafiə edər, xəstələndikdə isə onun qulluğunda dayanar və köməklik göstərər.[60]

Həmçinin yerə düşməmək üçün divarsız damlarda yatmaq da yasaq edilmişdir. Bu barədə Allah elçisi buyurur: *«Kim örtüsüz damlarda gecələsə, zimməlik[61] hüququndan məhrum olar».*[62]

Çünki insan örtüsüz və onun düşməsinə mane ola biləcək hər hansı bir amilin olmadığı döşəmədə yatdığı zaman ola bilsin ki, o tərəf, bu tərəfə çönsün və bununla da dünyasını dəyişsin. Yerə düşməsi isə onun ölümü ilə nəticələnə bilər. Belə olan halda heç kəs onun ölümündən şikayət etməyəcək, nəticədə dünyasını dəyişən şəxsin zimməlik hüququ bitmiş olacaq. Yaxud da etinasızlığı, laqeydliyi Allahın onu qorumamsına, Öz hifzi altına almamasına səbəb olacaqdır. Çünki onun ölümündə əsaslı bir səbəb olmamışdır.

Qeyd olunmalıdır ki, evlərdəki pişiklərin qab-qacaqdan içmələri və yemələri onları murdarlamır. Bu barədə Abdullah ibn Əbu Qətadə atasının dilindən rəvayət edərək bildirir ki, bir dəfə atasıına dəstəmaz almaq üçün qabda su gətirirlər. Bu zaman pişik onu qabını yalayır (dilini qabdakı suya vurur) və Əbu Qətadə dəstəmaz almağa başlayanda ətrafındakılar: "Ey Əbu Qətadə! Həmin qaba pişiyin ağzı dəyib" – deyə onu xəbərdar edirlər. Əbu Qətadə isə: "Mən Allah elçisinin: *«Pişik ailədəndir, o sizin ətrafınızda dövr edən erkək və dişilərdəndir»* – deməsini eşitmişəm" – deyərək cavab verir.[63] Digər rəvayətdə isə Allah

---

[59] Əhməd, Müsnəd 2/91.
[60] «əl-Fəth ər-Rabbani», 5/64.
[61] İslam ölkəsində təhlükəsiz yaşamaq hüququ.
[62] Əbu Davud, «əs-Sünən», hədis 5041; «əs-Sahih əl-Cəmi», 6113.
[63] Əhməd, Müsnəd 5/309; «əs-Sahih əl-Cəmi», 3694.

elçisinin pişik barədə belə deməsi bildirilir: *«Həqiqətən, o, murdar deyil. O sizin ətrafınızda dövr edən erkək və dişilərdəndir».*[64]

## AİLƏDƏ İCTİMAİ MƏSƏLƏLƏR
### Nəsihət 13
### Ailə məsələlərini müzakirə etmək üçün yığıncaqlar təşkil etmək

Bu barədə Allah-taala Quranda buyurur: **«O kəslər üçün ki, Rəbbinin dəvətini qəbul edər** [*iman gətirər*]**, namaz qılar, işlərini öz aralarında məsləhət-məşvərətlə görər, onlara verdiyimiz ruzidən** [*Allah yolunda*] **sərf edərlər».**[65]

Ailə ilə əlaqədar olan ailə daxili və xarici məsələləri müzakirə etmək üçün fürsət düşdüyü zaman münasib bir halda ailə üzvlərinin bir araya gəlməsi ailənin birliyini, həmrəyliyini və əlbirliyini göstərir. Heç şübhəsiz ki, Allahın ailəyə başçı olaraq təyin etdiyi şəxs ilk cavabdeh və qərar sahibidir. Bununla bərabər ailədə başqalarına, xüsusən də uşaqlar böyüdüyü zaman onlara mövcud məsələ barədə öz fikirlərini bildirməsi üçün fürsətin tanınması onların məsuliyyət daşıdıqlarını hiss etmələri üçün bir davaranış olmaqla yanaşı, həm də valideynləri tərəfindən fikirləri soruşulduğu zaman qiymətli rəylər söylədiklərini hiss edərək hamını sevindirmiş olarlar. Ailədə müzakirə olunan məsələlərə misal olaraq aşağıdakıları göstərmək olar:

Ramazan ayında və başqa tətillərdə həcc və ümrə ziyarətləri ilə bağlı məsələlərin müzakirəsi, qohumları ziyarət etmək üçün səfərə çıxmaq, istirahət etmək, toy mərasimləri təşkil etmək, uşağın dünyaya gəlməsi münasibəti ilə heyvan kəsmək, bir evdən başqa evə köçmək, xeyirli planlar həyata keçirmək (məhəllədə kasıbların siyahısını tutaraq onlara müxtəlif köməkliklər təqdim etmək və ya qida məhsulları ilə onları təmin etmək), müxtəlif ailə vəziyyətlərini, yaxud qohum-əqrabanın problemlərini müzakirə etmək və bu problemlərin həllində necə iştirak etmək və s.

---

[64] Əhməd, Müsnəd 5/309; «əs-Sahih əl-Cəmi», 2437.
[65] əş-Şura, 38.

Qeyd edilməlidir ki, ailə toplantılarının bir növü və olduqca əhəmiyyətlisi valideynlər və övladlar arasında olan səmimi söhbətlərdir. Həqiqətən, həddi-buluğa çatmış övladların üzləşdiyi elə problemlər vardır ki, onların həllini yalnız təkbətək söhbətlərdə axtarmaq lazımdır. Belə ki, ata oğulla bir xəlvətə çəkilərək onunla gənclik, yetişkənlik dövrü ilə əlaqədar olan problemlər haqqında söhbət edir. Həmçinin ana da qızı ilə təkbətək qalaraq ona ehtiyac duyduğu dini əhkamları öyrədir, qızına özü də bu yaşda olarkən üzləşdiyi problemlərin həllində köməklik edir. Ümumiyyətlə ata və ananın övladları ilə söhbətə "Mən də sənin yaşda olanda…" ifadəsi ilə başlamalarının övladları tərəfindən məsləhətlərinin qəbul olunmasında böyük təsiri vardır. Lakin valideynlərlə övladlar arasında bu cür səmimiyyətin olmaması həmin övladların bəzilərini əxlaqsız, pis yolun yolçusu olan kişi və qadınlarla yoldaşlıq etməyə gətirib çıxarır. Nəticədə isə böyük bir bədbəxtçiliyin əsası qoyulur.

## Nəsihət 14
## Ailəvi ziddiyətlərin və münaqişələrin övladlar qarşısında edilməməsi

Münaqişəsiz, ziddiyyətsiz ömür sürən ailələrə çox nadir hallarda rast gəlmək olar. Lakin sülh yaratmaq xeyir, haqqa dönmək isə fəzilətdir.

Qeyd etmək lazımdır ki, ailənin həmrəyliyini sarsıdan, onun daxili bünövrəsinin salamatlığına zərər yetirən amillərdən biri də ər-arvad arasında olan münaqişələrin, ziddiyyətlərin və çarpışmaların ailə üzvləri qarşısına çıxarılmasıdır. Bu hal övladlara və xüsusən də azyaşlılara pisixi təsir göstərməklə yanaşı, həm də ailə üzvlərinin iki və ya daha çox düşərgəyə bölünməsinə və ailədə pərakəndəliyin və vəhdətsizliyin yaranmasına səbəb olur.

Düşünün! Sizcə bir evdə ki, ata övladını: «Ananla danışma», ana isə: «Atanla danışma» – deyərək tərbiyə edirsə, onda o evin halı necə ola bilər. Belə olan halda isə uşaq iki tərəf arasında

qalır, pisixi sıxıntı və sarsıntı keçirir. Təkcə uşaq deyil hamı üzüntü içərisində yaşayır.

Əziz oxucular! Gəlin çarpışmaların, münaqişələrin yaranmamasına və bu ziddiyyətəlrin yarandığı halda isə onların gizli saxlanılmasına çalışaq. Bunun üçün də Allah-taaladan ürəklərimizi birləşdirməsini diləyirəm.

## Nəsihət 15
## Dini və əqidəsi bəyənilməyən insanların evə buraxılmaması

Allahın elçisi ρ buyurur: *«Pisliyin yoldaşı körüyün sahibinə bənzər».*[66] Buxarinin rəvayətində isə belə deyilir: *«Dəmirçi körüyü sənin evini və paltarını yandırar. Yaxud ondan pis bir iy duymuş olarsan».*[67]

Elədir. O sənin evini müxtəlif fəsadlarla yandırar. Məgər neçə-neçə fitnəkarların, fəsadçıların, şübhəli insanların evə gəlməsi ailə üzvləri arasında ədavətə, ərlə arvad arasında ayrılığa azmı səbəb olmuşdur?! Allah əri barədə qadını aldadan və qadın barədə də əri aldadaraq onların arasını vurmağa çalışanlara lənət eləsin! Allah ata ilə övlad arasında ədavətə səbəb olanlara lənət eləsin! Bəs evlərə caduların qoyulmasının, evlərdə bəzən oğurluq hadisələrinin baş verməsinin, əxlaq və tərbiyənin pozulmasının səbəbi nədir? Sözsüz ki, bu saydıqlarımızın başlıca bir səbəbi varsa, o da dini və əqidəsi bəyənilməyən insanların evə buraxılmasıdır. Belələri qonşu qadın və ya kişilərdən özlərini dost kimi göstərənlər olsa belə, onların evə girməsinə icazə verilməməlidir. Bəzi insanlar da vardır ki, onlar yoxsulluq və sıxıntının məngənəsi altında olduqları üçün belələri qapı ağzında dayandıqda onların aravuran fitnəkar olduqlarını bilə-bilə içəri girmələrinə göz yumurlar.

Evə bu cür insanların buraxılmaması məsələsində ananın payına bu məsuliyyətin böyük bir hissəsi düşür. Allahın elçisi ρ vida xütbəsində üzünü insanlara tutaraq soruşur: *«Ey insanlar! Hansı gün toxunulmazdır? Hansı gün toxunulmazdır? Hansı gün*

---

66 Əbu Davudun rəvaətindən parça, hədis 4829.
67 Buxari (şərhlə birlikdə), 4/323.

*toxunulmazdır?»* Səhabələr də: «Böyük həcc günü» – deyə cavab verirlər. Sonra Peyğəmbər ρ həmin günü xütbəsinin əsnasında camaata xitabən belə demişdir: *«Sizin qadınlarınız üzərindəki haqqınıza gəldikdə, onlar istəmədiyiniz adamları evinizə buraxmasınlar».*[68]

Ey müsəlman qadın! Əgər ərin və ya atan qonşu qadınların birinin ailədə fəsad törədəcəkləri aşkar olunduğu zaman evə buraxılmasına qadağa qoymuş olsa, ürəyində buna görə əsəbləşmə. Belə qadınlardan biri səninlə öz əri ilə sənin ərin arasındakı müqayisələrdən danışsa, bu zaman ağıllı və mətanətli ol, çünki bu müqayisələr səni ərindən gücü çatmayan işləri tələb etməyə sövq edə bilər. Lakin evdə ərinin həmsüfrələrinin onu pis yola çəkdiklərini görmüş olsan, ona nəsihətlər verməlisən.

***Metod:***

***Bacardığın qədər evdə olmağa çalış!***

Ailə başçısının evdə olması işlərin öz qaydasında olmasına, ona ailə tərbiyəsini, ailədəki neqativ halların islah edilməsini nəzarətdə saxlamağa imkan yaradır. Bəzi insanlara görə ən əsası odur ki, evdən çıxsın, əgər getməyə bir yer tapmasa, geri evə qayıdacaqdır. Bu xətalı bir prinsipdir. Əgər insan ibadətlər və ya yaxşı işlər üçün evdən çıxırsa, bunun da bir ölçüsü və həddi olmalıdır. Yox, əgər insanın evdən çıxması günahların işlədilməsinə, vaxtın itirilməsinə və başının dünya işlərinə həddən artıq qarışmasına səbəb olarsa, onda insan bu ticari işlərini yüngülləşdirməli, boş-boş görüşlərinə son qoymalıdır.

***Ailə üzvlərini itirib gecələri əyləncə mərkəzlərində keçirənlər necə də bədbəxtdirlər…***

## Nəsihət 16
## Ailədə övladlar üzərində nəzarət yaratmaq və bunda çox diqqətli olmaq

1. Övladlarının dostları kimlərdir?

2. Əcəba, daha öncə onlarla qarşılaşmısanmı, tanış olmusanmı?

---

[68] Hədisi Tirmizi (hədis 1163) və digər ravilər Amr ibn əl-Əhvasdan rəvayət etmişlər; «əs-Sahih əl-Cəmi», 7880.

3. Övladların özləri ilə bayırdan nə gətirirlər?
4. Övladlarınızın siyirtmə qutularında, çantalarında, yastıqlarının, döşəklərinin və çarpayılarının altında nə vardır?
5. Qızın kiminlə və hara gedir?

Elə atalar vardır ki, övladlarının əlində pis şəkillərin, əxlaqsız filmlərin və bəlkə də narkotik maddələrin olmasından bixəbərdirlər. Elələri də vardır ki, qızının xidmətçi ilə bazara gedərək onu sürücünün yanında gözləməyə vadar etməsindən, özünün isə hansısa bir şeytanla görüşə getməsindən xəbəri belə yoxdur. Elə qızlar da vardır ki, əxlaqsız rəfiqəsi ilə siqarət çəkmək, onunla əylənmək üçün onun yanına gedir. Övladlarını başlı-başlına buraxan bu cür valideynlər əzəmətli gündən və həmin günün dəhşətlərindən qaça bilməyəcəklər. Bu barədə Peyğəmbər ρ hədislərinin birində belə buyurur: *«Şübhəsiz ki, Allah-taala [Qiyamət günü] hər bir padşahı və ya hökmdarı öz rəiyyətləri barəsində və hər bir kişini də öz ailə üzvləri haqqında sorğu-sual edəcəkdir».*[69]

Lakin burada bir neçə mühüm məqam vardır və bunlar aşağıdakılardır:
1. Valideynin övlad üzərindəki nəzarəti və onu təqib etməsi gizli olmalıdır.
2. Qorxutma (təhdid) olmamalıdır.
3. Övlad etibarının itirildiyini duymamalıdır.
4. Valideyn nəsihətlərində və cəza tədbirlərində övladlarının həyatını, dərrakəsini və buraxdıqları səhvin dərəcəsini nəzərə almalıdırlar.
5. Mənfi təsir göstərə biləcək müfəssəl tədqiqatdan və şəxslərin siyahısının tutulmasından çəkinilməlidir.

Bir nəfər mənə danışırdı ki, ata olan bir nəfər oğlunun buraxdığı səhvləri tarix və təfsilatı ilə birlikdə kompyüterin yaddaşına köçürür. Hər dəfə səhv buraxdıqda ata oğlunu yanına çağırtdırır və kompyüterdə oğlu üçün xüsusi bir qovluq açır. Övladın hazırkı yalnışlıqları ilə yanaşı keçmişdə olan səhvlərini də sadalayır.

---

[69] Hədisin isnadı **həsəndir**. Nəsai, İbn Hibban Ənəsdən rəvayət edib. «Səhih əl-Cəmi», 1775; «əs-Silsilətu əs-Sahih», 1632.

***İzah:***

Biz hansısa bir şirkətdə və ya idarədə işçi deyilik və ata da pis əməlləri yazmaq üçün təyin olunmuş mələk deyildir. Qoy bu ata islam tərbiyəsinin əsasları haqqında çoxlu-çoxlu oxusun.

Bildiyimə görə haqqında danışdığımız atanın tam əksi olaraq elə valideynlər vardır ki, onlar övladlarının işlərinə müdaxilə etməyi qətiyyən sevməzlər. Çünki onlar düşüncələrinə görə övlad səhv edib sonra da etdiyi hərəkətin səhv olduğunu özü etiraf etməsə, səhvi səhv, günahı günah kimi əsla qəbul etməz və bununla razılaşmaz. Bu yalnış ideologiya uşaqların qərb fəlsəfəsi südü ilə bəslənilməsindən və onların azadlıqların çirkin prinsiplərinə görə süddən kəsilməsindən doğan bir nəticədir. Bu nəticə sayəsində həm "süd verən", həm də "süddən kəsən" bədbəxt olur.

Bəzi atalar da övladlarının onları acılamasından, istəməməsindən qorxaraq onların ipini boş buraxır və: «Nə edirsə etsin, mən balamın sevgisini qazanıram» – deyirlər. Bəziləri isə keçmişdə öz atasından gördüyü sərt rəftardan təsirlənərək övladını başlı-başına buraxır və elə hesab edir ki, vaxtilə atasının ona qarşı etdiyi rəftarın tam əksini etməlidir.

Bəzilərinin isə alçaqlıq və qeyrətsizlik o qədər qanına işləmişdir ki: «Qoy oğlum, qızım cavanlıqdan, gənclikdən ləzzət alsınlar, istədikləri kimi yaşasınlar» – deyərək övladlarının əxlaqsızlıqlarına haqq qazandırırlar. Görəsən beləəri heç düşünürmü ki, Qiyamət günü övladları: «Ey ata! Nəyə görə sən məni günahlar, əxlaqsızlıqlar içində buraxıb getdin?!» – deyə onların yaxasından yapışacaqdır.

## Nəsihət 17
## Ailədə uşaqlara qayğı və maraq göstərmək

Bu məsələyə bir neçə aspektdən yanaşmaq lazımdır və bunlar aşağıdakılardır:

***1. Qurani-Kərimin və dini hekayələrin əzbərlətdirilməsi***

Atanın uşaqlarını ətrafına toplayıb onlara sadə şərhlə Quran oxutdurması, Quran əzbərlədikləri üçün onlara mükafatlar

verməsi necə də gözəl bir haldır. Elə azyaşlı uşaqlar vardır ki, onlar hər cümə günü ataları əl-Kəhf surəsini oxuyarkən onların dilindən bu surəni əzbərləmişlər. Peyğəmbər ρ Abdullah ibn Abbasa deyir: *«Allahı qoru ki, o da səni qorusun».*

Hədisdə də qeyd olunduğu kimi uşaqlara islam əqidəsinin əsasları, ədəb-ərkan qaydaları, yemək yeyərkən, yatarkən, asqırarkən oxunulan zikr və duaları, həmçinin salam verməyin, icazə istəməyin qaydaları öyrədilməlidir. Dini hekayələrdən misallar gətirməyin uşaqlara böyük təsiri vardır və bu uşaqlarda bir oyanış yarada bilər. Bu hekayələrdən bəzilərinin adlarını sizin üçün sadalamaq istərdik: Nuh əleyhissəlamın hekayəti, dünyanı su basması haqqında hekayət, İbrahim əleyhissəlam, onun bütləri dağıtması və oda atılması hekayəti, Musa əleyhissəlam, onun Firondan xilas olması və Fironun suda batması hekayəti, Yunusun nəhəng balığın qarnında olması haqda hekayət, Yusif əleyhissəlamdan bəhs edən hekayətin müxtəsər forması, Məhəmməd peyğəmbərin ρ bi`sə (Məkkə) və hicrət (Mədinə) dövrü həyatı, Bədr, Xəndək və digər döyüşlər haqqında müxtəsər əhvalatlar, Peyğəmbərin ρ öz dəvəsini ac saxlayaraq onu yoran kişi ilə olan əhvalatı, əməlisaleh insanların başlarına gələn əhvalatlar, Ömər ibn əl-Xəttabın τ öz arvadı və ac övladları ilə birlikdə çadırda olması, xəndək sahiblərinin əhvalatı, Nun surəsində haqqında danışılan bağ sahiblərinin hekayəti, mağaradakı üç kişinin əhvalatı və bu qəbildən olan, uşaqların başa düşə biləcəkləri sadə şərhlər və yüngül pozalarla müxtəsər şəkildə yazılmış, həmçinin bizləri əqidəmizə zidd, mövhümatçı, yaxud uşaqlarda reallığı əks etdirən düşüncələrin məhvinə təsir edən, onların qəlbinə cəsarətsizlik və qorxaqlıq toxumlarını səpən hekayələrdən uzaqlaşdıran digər maraqlı və ibrətamiz əhvalatlar saysız dərəcədə çoxdur.

***2. Uşaqların hər yoldan ötənlə gəzməsində ehtiyatlı olmaq***

Uşaqların hər yoldan ötənlə gəzməsində ehtiyatlı olmaq lazımdır. Belə olan halda uşaqlar vaxtlarını birgə keçirdiyi adamlardan pis sözlər və əxlaqsızlığı nümayiş etdirən pis hərəkətlərlə evə qayıdırlar. Bunun qarşısını almaq üçün də

uşaqlarla evdə oynaya biləcək qohum və ya qonşu uşaqlarından seçib evə çağırmaq lazımdır.

***3. Uşaqları əyləndirən oyuncaqlara diqqət yetirmək***

Uşaqların öz oyuncaqlarını yerləşdirdikləri oyuncaq otağının və ya xüsusi dolabın olmasına, həmçinin müsiqi alətləri, nərd və xaç əlamətləri olan oyuncaqlar kimi şəriətə zidd olan oyuncaqların evdən kənarlaşdırılmasına diqqət yetirmək lazımdır. Yaxşı olardı ki, oğlan uşaqlarının həvəsi dülgərlik, elektronika, mexanika kimi peşələrlə bağlı olan məşğuliyyətlərə, həmçinin qəbahət sayılmayan kompyuter oyunlarına yönəldisin. Lakin yeri gəlmişkən sizi kompyuter üçün nəzərdə tutulan əyləncə proqlamlarının və içində xaç əlamətləri olan oyunların təhlükəli olması barədə də öncədən xəbərdar edirik. Belə ki, bu əyləncə proqlamları ekranda qadın surətlərinin son dərəcə əxlaqsız bir şəkildə nümayişi üçün hazırlanmışdır. Bu proqramlardan biri kopyuterlə qumar oyunudur. Belə ki, oyunçu ekranda görünən və qarşı tərəfi təmsil edən dörd qadın şəklindən birini seçir. Oyunda qalib çıxdığı halda qalibiyyətinin mükafatı olaraq qadın şəkli çox əxlaqsız bir tərzdə ekranda görünməyə başlayır.

***4. Oğlan uşaqları ilə qız uşaqlarının yataqlarını ayırmaq***

Oğlan uşaqları ilə qız uşaqlarının yataqlarını ayırmaq dindarların və bu buna diqqət yetirməyənlərin evlərinin tərtibatının bir hissəsidir.

***5. Zarafat və nəzakətli rəftar***

Allahın ρ elçisi uşaqlarla zarafatlaşar, dilxoşluq edər, başlarını sığallar, onları səslərkən nəzakətlə səslər, meyvəni ilk olaraq onların ən kiçiyinə verər və uşaqlar da hərdən onun arxasına düşərdilər. Peyğəmbərin ρ nəvələri Həsən τ və Hüseynlə τ zarafatlaşmasına aid iki misalı aşağıda sizə təqdim edirik:

Əbu Hüreyrədən τ rəvayət olunur ki, Allahın elçisi ρ Həsən ibn Əliyə τ dilini çıxartdı. Uşaq onun dilinin qırmızılığını görüb ona sarı qaçdı.[70]

Yəla ibn Əbu Mürradan onun belə deməsi rəvayət olunur: *«Bir dəfə Peyğəmbərlə ρ bir yerə getdik və bu zaman yeməyə dəvət olunduq. Hüseyn də yolda oynayırdı. Peyğəmbər ρ tez*

---

[70] Əbu Şeyx, «əs-Silsilətu əs-Sahih», 70.

*camaatın önünə keçib əllərini açdı. Uşaq o tərəf bu tərəfə qaçırdı. Peyğəmbər ρ də onunla zarafatlaşırdı. Allahın elçisi onu götürdü. Bir əlini çənəsinin altına, o biri əlini başının arxasına qoyaraq onu öpdü».*[71]

Əziz oxucu! Haqqında danışdığımız mövzu uzun mövzudur. Fürsət düşdüyü zaman Allahın izni ilə bu mövzu haqda ayrıca bir risalədə danışacağıq.

### Nəsihət 18

## Yatmaq və yemək vaxtlarının tənzimlənməsində qətiyyət

Bəzi evlər vardır ki, onların halı insana mehmanxanaların halını xatırladır. Bu cür evlərin sakinləri az qala bir-birilərini tanımırlar, az-az hallarda bir-biriləri ilə rastlaşırlar.

Bəzi ailələrdəki uşaqlar istədikləri vaxt yeyir, istədikldəri vaxt da yatırlar. Bu da yuxusuzluğa, vaxtın boş yerə itirilməsinə, qida reciminin pozulmasına (dalbadal yeməyə) gətirib çıxarır. Bu özbaşnalıq isə əlaqələrin pozulmasına, əməyin və vaxtın boş yerə sərf edilməsinə və insanlarda recimin, nizam-intizamın pozulmasına səbəb olur. Bəlkə də biz üzrlü olmağımızı səbəb götürə bilərik. Tələbələr və məktəblilər də təhsil aldıqları universitetlərdən və məktəblərdən eyni vaxtda qayıtmırlar. Məmurların, iş adamlarının, sahibkarların iş vaxtı da bir deyil. Onlar üçün də bu üzrlü hesab oluna bilər. Lakin bu hal hamıda mövcud deyil. Bir ailənin süfrəyə bərabər oturmasından, hal-vəziyyətin öyrənilməsi və faydalı müzakirələrin aparılması üçün fürsəti düzgün dəyərləndirə bilməsindən gözəl nə ola bilər?! Ailədə evə qayıtma vaxtının dəqiqləşdirilməsi ailə başçısının – atanın üzərinə düşən məsuliyyətdir. Bununla yanaşı ailə üzvləri, xüsusən də azyaşlılar və ağıl çatışmamazlığı olanlar (onları daim nəzarətdə saxlamaq lazımdır) evdən çıxdıqları zaman ailə başçısından izn almalıdırlar.

---

[71] Buxari, «əl-Ədəbul-Mufrəd»,364; İbn Macə, 1/29.

## Nəsihət 19
## Qadının evdən kənarda işləməsinin nizamlanması

İslam qanunları bir-birilərini tamamlayır. Allah-taala qadınlara: **«Evlərinizdə qərar tutun…»**[72] – deyə əmr etdiyi zaman onların maddi cəhətdən təmin edilməsini ata və ərin üzərinə buraxdı. Əslində qadın zərurət olmadıqca evindən kənarda işləlməməlidir. O vaxt ki, Musa su quyusuna çatanda orada qoyunlarını su içməyə, başqalarının hevanlarına qarışmağa qoymayan və orada gözləyən əməlisaleh kişinin iki qızını gördükdə onlara dedi: **«…"Sizə nə olub, dərdiniz nədir?" Onlar: "Çobanlar** [*heyvanlarını*] **sulayıb getməmiş biz** [*qoyunlarımıza*] **su vermirik. Atamız da ixtiyar bir qocadır** [*buna görə qoyunları sulamağa biz gətiririk*]**", – deyə cavab verdilər».**[73] Haqqında danışdığımız iki qız evdən çıxmalarına qoyunları sulamaq kimi üzrləri vardır. Çünki ailə başçısı ixtiyar çağında olduğu üçün bu işi görə bilmir. Buna görə də fürsət düşdüyü zaman bayırda işləməkdən xilas olmağa can atmaq lazımdır. **«O iki qızın biri dedi: «Atacan! Onu muzdla çoban tut, çünki bu güclü və etibarlı adam** [*indiyə qədər*] **muzdla tutduqlarının ən yaxşısıdır!»**[74]

Ayədən də göründüyü kimi qız öz sözləri ilə bayırda işləyərkən üzləşdiyi ədəbsizlikdən və əziyyətlərdən özünü qoruması üçün evə qayıtmaq istədiyini açıq-aşkar bildirir.

XX əsrdə ikinci dünya müharibəsindən sonra müharibənin dağıntılarını aradan qaldırmaq üçün vəziyyətin çıxılmaz olduğu bir vaxtda kişilərin sayında olan çatışmamazlığın yerini doldurmaq üçün dünya dövlətləri (qeyri-islam dövlətləri) qadınların işləməsinə ehtiyac duyulduğunu bildirdilər. Bu zaman qadını, sonra da cəmiyyəti əxlaqsızlaşdırmaq və korlamaq məqsədilə hazırlanmış «Qadın azadlığı» adlı yəhudi planı get-gedə irəliləməyə və qadın hüquqları çağırışları eşidilməyə başlandı.

---

[72] əl-Əhzab, 33.
[73] əl-Qəsəs, 23.
[74] əl-Qəsəs, 26.

Nəticədə də qadının cəmiyyət arasında fəaliyyət göstərməsi məsələsi birdən-birə ortaya çıxdı.

İslam dövlətlərindəki səbəblərin yuxarıda göstərdiyimiz dövlətlərdəki səbəblərdən fərqli olmasına baxmayaraq müsəlman olan kəs öz ailəsini qorumalı və onun maddi ehtiyaclarını ödəməlidir. Lakin qadın azadlığı hərəkatının göstərdiyi fəaliyyət nəticəsində iş elə həddə çatmışdır ki, ilk olaraq qadının təhsil alması üçün xaricə göndərilməsi, sonra isə bu diplomların hədər getməməsi üçün onların işlə təmin olunması tələbləri səslənilməyə başlanmışdır. Lakin islam cəmiyyətlərinin qadınların belə geniş miqyasda işləməsinə ehtiyacı yoxdur. Çünki qadınlar üçün davamlı iş yerlərinin açılmasına baxmayaraq işsiz kişi kütlələrinin olması bu ehtiyacın olmamasını göstərən amillərdəndir. Biz bu geniş miqyaslı kütlənin işləməsinə ehtiyac olub-olmaması məsələsində yalnız dini şərtlərə uyğun olaraq onların təhsil, səhiyyə kimi sahələrdə işləmələrinə ehtiyac olduğunu nəzərdə tuturuq. Əslində müqəddiməyə bu cür başlamağımızın səbəbi bəzi qadınların ehtiyac olmadan, bəzən də çox az bir maaşdan ötəri işə getməsidir. Çünki onlar maaşa ehtiyac duymadıqları halda belə və hətta işlədikləri yerin onlara layiq bir yer olmadığı təqdirdə də işə getmələrini lazım bilirlər. Nəticədə də xoşagəlməz hadisələr və böyük fitnələr baş verir.

Qadının işləməsi probleminə dair islam metodu ilə dünyəvi metod arasındakı ən başlıca fərq odur ki, islam nöqteyi-nəzərdən qadın başlıca olaraq **«Evlərinizdə qərar tutun…»** ayəsindəki əmrə riayət etməlidir. Zəruri hallarda isə evdən çıxması aşağıdakı hədisdə də qeyd edildiyi kimi caizdir. Allah elçisi ρ qadınlara xitabən buyurmuşdur: *«Ehtiyac duyduğunuz hallarda evdən bayıra çıxmanıza icazə verildi».*[75] Lakin dünyəvi qanunlara görə qadının istənilən vəziyyətdə sərbəst olaraq evdən bayıra çıxmaq hüququ vardır.

Ədalət naminə deyirik: həqiqətən qadının işləməsi üçün zərurət ola bilər. Yəni qadının əri öldükdən, atası yaşa dolduqdan və ya buna bənzər hadisələrdən sonra ailənin yükü onun üzərinə düşür və onun işləməsi zərurətə çevrilir. Bəzi ölkələrdə cəmiyyət

---

[75] Buxari və Müslim.

islam qanunları əsasında qurulmadığından qadın əri ilə bərabər ailə xərclərini ödəmək üçün məcburi olaraq işə göndərilir, kişi yalnız işi olan qadınlarla evlənir, hətta bəzi kişilər evlənərkən arvadının işləməsi barədə şərt də kəsirlər.

Xülasə, qadının zərurət olduğu halda, Allaha dəvət kimi islami məqsədlər naminə maarifçilik sahəsində, yaxud da övladı olmayan bəzi qadınlar kimi məşğuliyyət üçün işləməsi caizdir.

***Qadının evdən kənarda işləməsinin bəzi mənfi cəhətləri:***

1. Kişilərlə qaynayıb-qarışmaq, tanışlıq, onlarla tək qalmaq, yad kişilər üçün ətirlənmək və bəzənmək kimi bir çox şəriət qadağalarının baş verməsi və sonda da bunun qadının fahişəliyi ilə nəticələnə bilməsi.

2. Ərin hüquqlarını tapdalamaq, ailə məsələlrinə sayğısızlıq göstərmək və övladların haqqının ödənilməsində əskikliyin və qüsurların meydana gəlməsi (bu bizim əsas mövzumuzdur).

3. Bəzi qadınlarda kişi himayəsi və qayğısı ilə yaşamağın həqiqi mənasının düzgün başa düşülməməsi. Gəlin, ərinin ixtisası kimi və ya daha yüksək (bu əslində eyb deyildir) bir ixtisaslı qadını, yaxud ərinin maaşından daha çox maaş alan qadını təsəvvür edək. Görək bu qadın lazımi şəkildə özünün ərinə olan ehtiyacını hiss edəcəkmi, o ərinə tam itaətkarlıq göstərəcəkmi? Bəzi qadınlar istisna olmaqla qadınların buna ehtiyac hiss etməməsi ailənin mövcudluğunu bünövrəsindən titrədəcək problemlərə səbəb ola bilər. Vəzifəli qadının və ailənin maddi təminatı kimi problemlər də heç vaxt bitməz.

4. Qadın təbiətinə uyğun olmayan fiziki yorğunluq, psixoloci və əsəb gərginliyi.

Qadının işləməsinin mənfəətlərini və törətdiyi fəsadları qısaca gözdən keçirdikdən sonra deyirik: Allah qorxusunun olması, məsələnin şəriət qanunları ilə ölçüb-biçilməsi və qadının işə getməsinin caiz olduğu və olmadığı hal-vəziyyətlərin öyrənilməsi labüddür. Dünya malları bizi haqq yolundan sapdırmasın. Müsəlman qadına nəsihətimiz isə odur ki, Allahdan qorxsun, əri ondan həm onun özü, həm də ailənin mənafeyi üçün işini buraxmasını istərsə, ona itaət etsin. Ər də öz növbəsində intiqam tədbirlərindən əl çəkməli və haqsız olaraq arvadının malını, haqqını yeməməlidir.

## Nəsihət 20
## Ailə sirlərinin qorunması

Ailə sirlərinin qorunması aşağıdakı maddələri əhatə edir:

1. Ər-arvad arasındakı intim əlaqənin heç kəsə danışılmaması.

2. Ər-arvad arasındakı mübahisələrin və ziddiyyətlərin evdən kənara sızmaması.

3. Ailəyə, yaxud ailə üzvlərinə zərər gətirə biləcək istənilən aşkarlığın açıqlanmaması.

***1. Ər-arvad arasındakı intim əlaqənin heç kəsə danışılmaması***

Bu maddənin qadağan olunmasını göstərən hədis:

Peyğəmbər ρ buyurmuşdur: *«Qiyamət günü Allah dərgahında dərəcə baxımdan insanların ən pisi öz arvadı ilə cinsi əlaqədə olduqdan sonra bu sirri başqalarına yayandır».*[76]

Haqqında danışdığımız mövzunun qadağalığını göstərən dəlillərdən biri də Əsma bint Yəziddən nəql olunan hədisdir. Belə ki, bir dəfə o, Allah elçisinin ρ yanında idi. Bir çox kişi və qadınlar da burada əyləşmişdilər. Peyğəmbər ρ buyurdu: *«Deyəsən, hansısa kişi öz arvadı ilə etdiklərini danışır. Deyəsən, qadınlardan da öz əri ilə etdiyini xəbər verən var».* Camaat susmuşdu. Dedim: «Ey Allahın elçisi! Vallah elədir. Qadınlar da, kişilər də belə edirlər». Dedi: *«[Ey camaat!] Belə etməyin. Çünki bu erkək şeytanın dişi şeytanla yolda qarşılaşdığı zaman camaatın gözü önündə onunla cinsi əlaqədə olmasına bənzəyir».*[77]

Əbu Davudun rəvayətində isə deyilir ki, Peyğəmbər ρ üzünü kişilərə tutub soruşdu: *«Arvadınızla cinsi əlaqədə olduğunuz zaman qapını bağlayır, pərdələri salırsınızmı, Allahın pərdəsi arxasında gizlənirsinizmi?»* Camaat: «Bəli» – deyə cavab verdilər. Sonra o, yenə dedi: *«Bundan sonra oturub: "Belə etdim, belə etdim" – deyirsinizmi?».* Bu zaman ortalığı sükut bürüdü. Peyğəmbər ρ üzünü qadınlara tutaraq sükutu pozdu: *«Sizin*

---

[76] Müslim, 4/157.
[77] Əhməd, 6/457.

*aranızda da bunu danışan varmı?»* Qadınlar da cavab verməyərək susdular. İridöşlü bir qız dizi üstə oturub başını Allah elçisinin onu görməsi və sözünü dinləməsi üçün ona tərəf uzatdı və sükutu pozaraq: «Ey Allahın elçisi! Qadınlar da, kişilər də bunu danışırlar» – dedi. Bu zaman Allahın elçisi üzünü camaata tutaraq dedi: *«Bilirsinizmi bu nəyə bənzəyir? Bu dişi şeytanın erkək şeytanla yolda qarşılaşdığı zaman erkək şeytanın camaatın gözü önündə dişi şeytanla olaraq öz ehtiyacını ödəməsinə bənzəyir».*[78]

2. Ər-arvad arasındakı mübahisələrin və ziddiyyətlərin evdən kənara sızmaması.

Ər-arvad arasındakı mübahisələrin və ziddiyyətlərin evdən kənar mühitə sızması əksər hallarda məsələni daha da mürəkkəbləşdirir. Çox vaxt kənar tərəflərin ər-arvad arasındakı anlaşılmazlıqlara müdaxilə etməsi soyuqluğun, kobudlduğun daha da artmasına səbəb olur. Belə olan halda problemin həlli yolunda ilk olaraq hakim vəziyyətə nəzarət etmək, ər, yaxud da arvad tərəfindən olan zorakılığın və zülmün qarşısını almaq üçün ər-arvadın yanında ən yaxın və etibarlı bir insanın qalmasını təmin edir. Yalnız nəzarətçinin ərlə arvad arasında ümumi barış yaratmaq işi çətinləşdiyi zaman Allah-taala bizə nə edəcəyimizi belə əmr edir: **«**[*Ey möminlər!*] **Əgər ər-arvad arasında ixtilaf olacağından qorxsanız, o zaman kişinin adamlarından bir nəfər və qadının adamlarından da bir nəfər münsif** [*vasitəçi*] **təyin edib** [*onların yanına*] **göndərin. Əgər bu iki vasitəçi ər-arvadı barışdırmaq istəsə, Allah da onların köməyi olar. Həqiqətən, Allah hər şeyi bilən və** [*hər işdən*] **xəbərdardır!»**[79]

***3. Ailəyə, yaxud ailə üzvlərinə zərər gətirə biləcək istənilən aşkarlığın açıqlanmaması.***

Ailəyə məxsus bəzi xüsusiyyətləri açıqlamaq ailəyə və ya ailə üzvlərinə zərər gətirə bilər. Bu da caiz deyildir. Çünki bunu Peyğəmbər ρ aşağıdakı hədisində də qadağan etmişdir. *«Nə özünüzə, nə də başqasına zəzər verməyin».*[80] Buna dair aşağıdakı ayənin təfsirinə nəzər salaq. Belə ki, Allah-taala

---

[78] Əbu Davud, «Sünən», 2/627; «əs-Sahih əl-Cəmi», 7037.
[79] ən-Nisa, 35.
[80] Əhməd, 1/313; «əs-Silsilətu əs-Sahih», 250.

buyurur: **«Allah kafirlərə Nuhun övrəti ilə Lutun övrətini məsəl çəkir. Onlar bizim qullarımızdan iki saleh bəndənin kəbini altında idilər. Onlar ərlərinə xəyanət etdilər…»**[81]

İbn Kəsir ayənin təfsiri haqqında aşağıdakıları söyləyir:

Nuhun arvadı Nuhun sirrini öyrənər və onunla bir nəfərin iman gətirdiyini xəbər tutardısa, dərhal Nuh qövmündən olan zalımlara bu barədə xəbər verərdi. Lutun arvadına gəldikdə, Lut kimi evinə qonaq edərdisə, arvadı bu barədə şəhər əhalisinin əxlaqsızlarına xəbər verərdi ki[82], [gəlib qonaqlarla əxlaqsız və pozğun hərəkət etsinlər].

## AİLƏDƏ ETİK VƏ ƏXLAQİ QAYDALAR

### Nəsihət 21
### Ailədə mehribanlıq

Aişədən rəvayət olunan bir hədisdə Allah elçisinin ρ belə dediyi bildirilir: *«Əgər uca və böyük Allah bir ailəyə xeyir istəsə, onlara mehribançılıq bəxş edər».*[83] Başqa bir rəvayətdə isə belə buyurur: *«Əgər Allah-taala bir ailəni sevsə, ora mehribançılıq salar».*[84] Yəni ailədə hamı bir-birinə mehriban davranar və şübhəsiz ki, bu da ailədəki xoşbəxtliyin ən əsas səbəblərindəndir.

Ailədə ər-arvad, valideyn-övlad arasındakı mehribançılıq ciddiyyətin verə bilməyəcəyi müsbət nəticələri verəcək qədər faydalıdır. Peyğəmbərdən ρ nəql olunan aşağıdakı hədisə nəzər salmış olsaq, bu fikrin öz təsdiqini tapdığını görmüş olarıq. Belə ki, hədisdə deyilir: *«Həqiqətən, Allah mehribançılığı sevir və nə ciddiyyətə, nə də başqa xüsusiyyətlərə əta etmədiyni mehrbançılıq naminə əta edir».*[85]

### Nəsihət 22
### Ev işlərində ailə üzvlərinə yardım etmək

81 ət-Təhrim, 10.
82 İbn Kəsir, Təfsir, 8/198.
83 Əhməd, Müsnəd, 6/71; «əs-Sahih əl-Cəmi», 303.
84 İbn Əbu Dünya və başqaları; «əs-Sahih əl-Cəmi», 1704.
85 Müslim, 2593.

Ailə işlərini özlərinə sığışdırmayan bir çox kişilər vardır. Belə kişilərin bəziləri elə hesab edirlər ki, ailəsi ilə birlikdə ev işlərinə başlamaq onların hörmətinə və səviyyəsinə xələl gətirər. Allah elçisinə ρ gəldikdə o, Aişənin τ dediyinə görə paltarını özü tikər, səndəllərini özü təmir edər və hər bir kişinin evində gördükləri işləri görərdi.[86]

Aişədən τ Allah elçisinin ρ evdə gördüyü işlər barəsində soruşduqda vaxtılə özünün şahidi olduqlarını belə xatırlamışdır: *«O da adi insanlar kimi bir insan idi. Paltarını özü təmizlər, qoyunu özü sağar və özünə qulluq edərdi».*[87]

Yenə də Aişədən τ Allah elçisinin ρ evdə nə etdiyi barəsində soruşduqda belə cavab vermişdir: *«Ailəsinə qulluq edərdi. Namaz vaxtı gəldikdə isə namaza gedərdi».*[88]

Əgər biz də bu gün belə etsək, bir neçə mənfəətli işləri gerçəkləşdirmiş olarıq. Bu mənfəətlər aşağıdakılardır:

***1. Allah elçisini təqlid etmiş olarıq.***

***2. Ailəmizə kömək etmiş olarıq.***

***3. Təvazökarlıq və sadəlik hiss etmiş olarıq.***

Elə kişilər vardır ki, qazan odun üstündə qaynadığı halda arvadından dərhal yemək gətirməsini tələb edir. Körpə bir tərəfdə əmizdirilməsini istəyərək ağladığı zaman uşağı qucağına alıb saxlamır, yeməyin süfrəyə gəlməsini azacıq da olsa, gözləmir. Biz də bütün bu hallara cavab olaraq deyirik: Qoy bu hədislər belələrinə bir ibrət dərsi olsun!

## Nəsihət 23
## Ailə üzvləri ilə zarafat və nəzakətli rəftar

Ailədə qadın və uşaqlarla nəzakətli rəftar etmək evdəki səadət və mehribançılıq ab-havasının hökm sürməsinə səbəb olacaq amillərdəndir. Bunun üçün də Allahın elçisi ρ Cabir ibn Abdullaha τ bakirə qızla evlənməsini nəsihət etmiş və onu

[86] Əhməd, Müsnəd, 6/121; «əs-Sahih əl-Cəmi», 4937.
[87] Əhməd, Müsnəd, 6/256; «əs-Silsilətu əs-Səhih», 671.
[88] Buxari (şərhlə birlikdə), 2/162.

həvəsləndirərək belə demişdir: *«Məgər bakirəylə sən bir-birinizlə əylənməzmisiniz, zarafatlaşmazmısınız?»*[89]

Həmçinin Peyğəmbər ρ buyurmuşdur: *«Dörd növ istisna olmaqla əyləncə və nəş`ənin heç bir növündə Allahın zikri yoxdur. [Bu dörd növ bunlardır:] kşinin arvadı ilə əylənməsi, …».*[90]

Bütün bunlarla bərabər peyğəmbər ρ öz sövcəsi Aişə ilə birldikdə çimərkən belə, onunla nəzakətli davranardı. Aişə τ bunu belə xatırlayardı: *«Allahın elçisi ilə çimərkən önümüzdəki bir qabdan su götürərdik. O məni ötüb keçər, mən də ona deyərdim: «Qoy mən də götürüm, qoy mən də götürüm».* Aişənin dediyinə görə onların hər ikisi də cünub idilər.[91]

Peyğəmbərin ρ oğlan uşaqları ilə nəzakətli və mülayim rəftarına gəlincə, bu barədə daha çox danışılanı nəvələri Həsən və Hüseynlə etdiyi bol-bol xoş rəftarı və davranışlarıdır. Bəlkə də, Allah elçisinin səfərdən qayıtmasına uşaqların sevinməsinin, onu qarşılamağa tələsmələrinin əsas səbəbi onun uşaqlarla bu cür xoş və mülayim rəftarıdır. Bu barədə səhih bir hədisdə belə deyilir: *«Peyğəmbər ρ səfərdən döndüyü zaman əhlibeytinin oğlan uşaqları tərəfindən qarşılanardı»*.[92]

Abdullah ibn Cəfərin dediyinə görə Peyğəmbər ρ uşaqları öz dövrəsinə alardı. *«Bir dəfə Peyğəmbər ρ səfərdən qayıdarkən onu mən, Həsən və Hüseyn qarşıladıq. Mədinyə daxil olana qədər birini qolları arasında, o birini isə arxasında daşıdı»*.[93]

Əziz oxucu! Bu davranışlarla bəzi hüznlü evlərin halını müqayisə et! Görərsən ki, orada düzgün zarafatdan (zarafat edərəkən yalnız doğru olanı söyləmək), nəzakətli rəftardan və mərhəmətdən heç bir əsər-əlamət yoxdur. Kim ki, övladları öpməyi atanın hörməti və ciddiyyəti ilə təzad təşkil etdiyini düşünürsə, qoy onda Əbu Hüreyrədən τ rəvayət olunan bu hədisi oxusun! «Allahın elçisi Həsən ibn Əlini öpdüyü zaman əl-Əqra ibn Habis ət-Təmimi də Peyğəmbərin ρ yanında

---

89 Buxari və Müslim; Buxari (şərhlə birlikdə), 9/121.
90 Nəsai; «əs-Sahih əl-Cəmi», 4534.
91 Müslim (Nəvəvinin şərhi ilə birlikdə), 4/6.
92 Müslim, 4/1885-2772.
93 Müslim, 4/1885-2772.

oturmuşdu. əl-Əqra dedi: «Mənim on övladım var, ancaq indiyədək onlardan birini belə öpməmişəm. Allahın elçisi onun üzünə baxdı, sonra dedi: *«Mərhəmət göstərməyənə, mərhəmət də göstərilməz».*[94]

### Nəsihət 24
### Evdə pis vərdişlərə qarşı mübarizə aparmaq

Ailə üzvlərindən biri yalançılıq, qeybət, dedi-qodu kimi pis vərdişlər ucabtından evdə tək qala bilmir. Bu cür pis vərdişlərə qarşı mübarizə qaçılmazdır. Bəzi insanlar bu cür halların müalicəsini yalnız cismani cəzalandırmada görürlər. Bu mövzuda Aişədən τ rəvayət olunan tərbiyəvi əhəmiyyətli bir hədisə diqqət yetirək: *«Əgər Allah elçisi ailə üzvlərindən birinin yalan danışdığını aşkar etsəydi, tövbə etmədiyi müddətdə onun üzünə baxmazdı».*[95]

Hədisdən də məlum olur ki, yalan danışanın üzünə baxmamaq, onu dindirməmək bu cür hallarda görülə biləcək əhəmiyyətli cəza tədbirlərindəndir və bəlkə də cismani tədbirlərdən də daha təsirlidir. Qoy bu barədə ailələrdəki tərbiyəçilər düşünsünlər.

### Nəsihət 25
### Qamçını ailə üzvlərinin görəcəyi yerdən asın![96]

Cəza məqsədi ilə əl yellətmək (şallaq vurmaq) əsas və mədəni tərbiyə üsullarındandır. Bunun üçün də qamçı və ya əsanın evdən asılmasının səbəbi belə izah olunur. Başqa bir rəvayətdə Allahın elçisi bu barədə buyurur: *«Qamçını ailə üzvlərinin gözü önündən asın. Çünki bu onlar üçün bir tərbiyədir».*[97]

Cəza alətinin asılı görünüşü pis niyyətli insanların bu alətin onlara da qismət olacağından qorxaraq əxlaqsız hərəkətlərdən

---

[94] Buxari (şərhlə birlikdə), 10/426.
[95] Əhməd, Müsnəd, 6/152; «əs-Sahih əl-Cəmi», 4675.
[96] Əbu Nəim, «əl-Hilyə», 7/332; «əs-Sahih əl-Cəmi», 1446.
[97] Təbərani, 10/344-345; «əs-Sahih əl-Cəmi», 1447.

uzaqlaşmalarına vadar edir və bu onlarda əxlaqi fəzilətlərlə ədəb-ərkana və əxlaqa maraq oyadır.

İbn əl-Ənbari deyir: «Peyğəmbər ρ qamçının asılmasını əmr etməklə kimi isə döyməyi nəzərdə tutmurdu və bunu heç kəsə də əmr etməmişdi. Lakin bununla demək istədiyi o idi ki, sən öz ailə üzvlərinin tərbiyəsi ilə məşğul olmaqdan kənara çəkilməyəsən».[98]

Döymək heç vaxt əsas metod deyildir. Bu vasitəyə ancaq tərbiyəçilikdə digər metodların tükəndiyi zaman, yaxud da vacib itaətlərə təhrik etmək üçün əl atmaq lazımdır. Bu barədə Allah-taala Qurani-Kərimdə buyurur: **«**[*Ey kişilər!*] **Özbaşınalıq etmələrindən qorxduğunuz qadınlara nəsihət edin,** [*yola gəlməzlərsə*] **onlardan yatağınızı ayırın və döyün».**[99] Uşaqlar barəsində isə Peyğəmbər ρ belə buyurur: *«Övladlarınızı yeddi yaşında ikən namaza aparın, on yaşa çatdıqda isə bunun üçün [namaz qılmaq istəmədikləri üçün] onları döyün».*[100]

[98] Bax: Feydul-qadir lil-munavi, 4/325.
[99] ən-Nisa, 34.
[100] Əbu Davud, Sünən, 1/334; «İrva əl-Qəlil», 1/266.

## AİLƏDƏ XOŞAGƏLMƏZ HƏRƏKƏTLƏR VƏ ƏDƏBSİZLİKLƏR[101]

**Nəsihət 26**
**Ərin evdə olmadığı zaman naməhrəm qoyumların evə daxil olmasında ehtiyatlılıq**

**Nəsihət 27**
**Ailəvi ziyarətlərdə qadınların kişilərdən ayrılması**

**Nəsihət 28**
**Evlərdəki sürücülərin və xidmətçi qadınların təhlükəli olmasına fikir vermək**

**Nəsihət 29**
**Özünün qadınlara oxşadan kişiləri evlərinizdən çıxardın!**

**Nəsihət 30**
**Ekranın təhlükəsindən ehtiyatlı ol!**

**Nəsihət 31**
**Telefonun şərindən ehtiyatlı olmaq**

**Nəsihət 32**
**Kafirlərin puç dinlərini və ya ilahlarını xatırladan rəmzlərin yox edilməsi**

**Nəsihət 33**
**Canlıların təsvirlərinin yox edilməsi**

**Nəsihət 34**
**Evlərinizdə siqarət çəkməyə imkan verməyin!**

---

[101] Əziz oxucular! Bu bölümün uzun və əhəmiyyətli olmasını nəzərə alaraq bu barədə “Ailələri qorxudan təhlükələr” adlı ayrıca bir risalədə bəhs edilmişdir.

# MƏNZİLİN DAXİLDƏN VƏ XARİCDƏN QURULUŞU

## Nəsihət 37
## Mənzilin yerinin əlverişliliyi və onun quruluşu

Şübhə yoxdur ki, həqiqi müsəlman evi üçün yer seçərkən başqalarının riayət etmədiyi ünsürlərə riayət edir.

***Mənzilin yeri***

**1.** Mənzil yer baxımından məscidə yaxın olmalıdır. Çünki bunda gizli olan böyük faydalar vardır. Belə ki, azan insana namazı xatırladır və onu namaz üçün yuxudan durquzur. Həmçinin məscidə yaxın olmaq insanların camaat namazına yetişməsi, qadınların məscid imamından qiraət və zikrləri eşitməsi və uşaqların həlqə vəziyyətində oturaraq Quran əzbərləməyə gəlmələri baxımından olduqca əlverişlidir.

**2.** Mənzil fasiqlərin çoxluq təşkil etdiyi ərazilərdə, yaxud kafirlərin yaşadıqları mərkəzində ümumi üzgüçülük hovuzu olan yaşayış binalarında və bu kimi ərazilərdə yerləşməməlidir.

**3.** Ev quruluşu elə olmalıdır ki, burada nə içrəidən bayırı, nə də bayırdan içərini görmək mümkün olsun. Əks təqdirdə pərdələrdən və divarların ucaldılmasından istifadə etmək lazımdır.

***Mənzilin quruluşu***

**1.** Qadınların naməhrəm kişi qonaqlarından ayrı dəhliz və ayrı zallarla ayrılmasına riayət edilməlidir. Bunun mümkün olmadığı təqdirdə isə pərdələrdən və arakəsmələrdən istifadə etmək lazımdır.

**2.** Pəncərələrə pərdə asılmalıdır ki, otaqlarda olanları xüsusən gecə işıqların yandığı zaman qonşu və küçədən keçən görməsin.

**3.** Ayaqyolu qiblə istiqamətində qurulmamalıdır ki, oradan istifadə edərkən də qibləyə tərəf dayanılmasın.

**4.** Geniş və çox xidmətli mənzil seçmək lazımdır. Çünki bunun bir çox səbəbləri vardır. Onlardan bəziləri aşağıdakılardır:

Allahın elçisi ρ buyurmuşdur: *«Həqiqətən, Allah-taala nemətinin əlamətini bəndəsinin üzərində görməyi sevir».*[102]

Yenə də Allahın elçisi ρ buyurmuşdur: *«Üç şey xoşbəxtliyin, üç şey isə bədbəxtliyin əlamətləridir. Xoşbəxtliyin birinci əlaməti odur ki, həyat yoldaşın əməlisaleh qadındırsa, onu görərkən halın daha xoş olsun, ondan ayrı düşdükdə isə həm onun özündən, həm də öz əmlakından arxayın ola biləsən. İkinci əlamət səni dostlarına çatdıra biləcək yüngül miniyin olmasıdır. Üçüncü əlamət isə geniş və çox xidmətli mənzilə sahib olmaqdır. Bədbəxtliyin əlamətlərinə gəldikdə onlardan birincisi odur ki, həyat yoldaşınla üz-üzə gəlməyin halının pisləşməsinə səbəb olsun, onun dilindən daim əziyyət çəkmiş olasan və ondan ayrıldığın zaman nə onun özündən, nə də öz əmlakından arxayın ola biləsən. İkinci əlamət ağır tərpənən miniyin olmasıdır ki, onu vurduğun zaman səni yorar, buraxdığın zaman isə səni dostlarına yetişdirməz. Üçüncü əlamət isə az xidmətli mənzilə sahib olmaqdır».*[103]

Bu səbəblərdən biri də ventilyasiya (havanı dəyişmə), günəş şüalarının daxil olması kimi sağlamlıq üçün xeyirli olan amillərin olmasına çalışmaqdır. Bütün bu və ya digər səbəblərin həyata keçməsi isə maddi qüdrət və əldə olan imkanlardan asılıdır.

## Nəsihət 38
## Mənzildən qabaq qonşu seçmək

Bu məsələnin əhəmiyyəti haqda ayrıca danışmağa ehtiyac vardır. Yaşadığımız əsrdə evlərin sıxlığı, insanların binalarda, mənzillərdə və yaşayış məntəqələrində toplanması səbəbindən qonşunun qonşuya təsiri böyükdür. Vaxtilə Allahın elçisi ρ xoşbəxliyin dörd əlamətini söyləyərkən onlardan birinin yaxşı qonşu olduğunu, bədbəxtliyin dörd əlamətindən danışarkən onlar arasında pis qonşunun da olduğunu qeyd etmişdir[104]. Sonuncunun təhlükəli və qorxulu olduğuna görə Allahın elçisi ρ öz dualarında həmişə belə deyərdi: *«Allahım! Əbədilik evindəki*

---

[102] Tirmizi, hədis, 2819. Hədis **həsəndir.**
[103] Hakim, 3/262; «Sahih əl-Cəmi», 3056.
[104] Əbu Nəim, «əl-Hilyə», 8/388; «Sahih əl-Cəmi», 887.

*pis qonşudan [cəhənnəmdən] Sənə sığınıram. Həqiqətən, səhra [dünya] qonşusu dəyişir».*[105] Bununla yanaşı müsəlmanlara da bundan həmişə Allaha sığınmalarını belə əmr edərdi: *«Əbədilik evindəki pis qonşudan [cəhənnəmdən]Allaha sığının! Həqiqətən, səhra [dünya] qonşusu səndən əl çəkir».*[106]

Pis qonşunun ər-arvada və uşaqlara təsir etməsi, onun verdiyi əziyyətlər və onun yanındakı həyatı zəhərlənmişlər haqqında hədislər misal çəkməyə imkanımız yoxdur. Bunun üçün də bu barədə qeyd edilən hədislərin bu sahədə tətbiq edilməsi kifayətdir. Bəlkə də bəzi yaxşı insanların ailələrinin qonşu olması üçün qonşu mənzilləri icarəyə götürmələri bəzi maddi vəsaitlər bahasına başa gəlsə də, qonşuluq probleminin həlli yolunda görülən əməli tədbirlərdəndir və həqiqətən, yaxşı qonşuluq mal-dövlətlə qiymətləndirilməz.

## Nəsihət 39
## Lazımi islahatların həyata keçirilməsinə və rahatlıq vəsaitlərinin bolluğuna diqqət yetirmək

İndiki zamanda məişət işlərini asanlaşdıran və vaxta qənaət edən kondisioner, soyuducu, paltaryuyan maşın və bu kimi rahatlıq vasitələrinin Allah tərəfindən bizə bəxş edilməsi Onun bu dünyada bizə olan nemətlərindəndir. İsrafçılığa yol vermədən və çətinlik çəkmədən ev sahibinin bu cihazların daha keyfiyyətliləri ilə evini təmin etməsi onun müdrikliyindən olardı. lakin burada faydalı təkmilləşdirmə işləri ilə qiyməti olmayan süni təmtəraqı ayırmaq lazımdır.

Evə məxsus xidmətlər və ya cihazlar sıradan çıxdığı zaman onun təmir edilməsi evə göstərilən diqqətdəndir. Lakin bəzi insanlar buna laqeyd yanaşırlar. Onların arvadları evdə həşəratların qopardıqları gurultudan, əl-üz vannasının dolub daşdığından, zibil vedrəsinin ətrafa yaydığı üfunətdən, sınmış və dağılmış mebel qırıntılarının evə səpələnməsindən şikayətlənirlər. Şübhəsiz ki, bütün bu hallar evdə səadətin olmasına maneçilik

---

105 Hakim, 1/532, «Sahih əl-Cəmi», 1290.
106 Buxari, «əl-Ədəbul Mufrad», 117; «Sahih əl-Cəmi», 2967.

törədir, evlilik və səhhət problemlərinin yaranmasına səbəb olur. Ağıllı insan isə buna bir əlac edər.

### Nəsihət 40
### Ailənin səhhətinə qarşı diqqətlilik və sağlamlıq tədbirləri

Allahın elçisi ρ ailə üzvlərindən biri xəstələndiyi zaman əl-İxlas, əl-Fələq və ən-Nas surələrini oxuyaraq dilucu ona tüpürərdi.[107] Başqa bir hədisdə isə belə deyilir ki, Allahın elçisi ρ ailəsini xəstəlik (qızdırmalı xəstəlik) yaxaladığı zaman duru xörək hazırlanmasını əmr edərdi və xörək hazırlanardı. Sonra onlara bundan qurtum-qurtum içməyi tapşırardı və onlar içərdilər.

Allahın elçisi ρ belə deyərdi: *«Həqiqətən, bu, həzin qəlbi gücləndirər, xəstə qəlbdən isə xəstəliyi sizin üzünüzdəki ləkəni su ilə təmizlədiyiniz kimi təmizləyər»*.[108]

***Bəzi profilaktik və sağlamlıq tədbirləri haqqında***

Allahın elçisi ρ buyurmuşdur: *«Axşam olduğu zaman uşaqlarınızı saxlayın. Çünki bu vaxt şeytanların yayılan vaxtıdır. Gecədən bir müddət keçdikdən sonra isə uşaqları buraxın, qapıları bağlayın, Allahın adını zikr edin, qab-qacaqlarınızın içinə bir şey (taxta və s.) qoymuş olsanız belə üstünü örtün, Allahın adını zikr edin və lampalarınızı söndürün».*[109]

Müslimin rəvayətində isə belə deyilir: *«Qapılarınızı bağlayın, qab-qacaqlarınızın üstünü örtün, lampalarınızı söndürün, tuluğunuzun*[110] *ağzını bərk-bərk bağlayın. Çünki şeytan bağlı qapını, örtüyü və kəndiri aça bilmir. Həqiqətən, siçan ev əhlinin acığına olaraq evi yandırır».*[111] (Yəni, lampanın fitilini dartaraq evdə yanğın törədər).

Yenə də Allahın elçisi ρ buyurmuşdur: *«Yatarkən evlərinizdə yanar od qoymayın».*[112]

***Möhtərəm müsəlman qardaş və bacılar!***

---

107 Müslim, hədis 2192.
108 Tirmizi, hədis 2039; «Sahih əl-Cəmi», 4646.
109 Buxari (şərhlə birlikdə), 10/88-89.
110 Tuluq: səridən hazırlanmış su qabı.
111 Əhməd, «Müsnəd», 3/301; «Sahih əl-Cəmi», 1080.
112 Buxari (şərhlə birlikdə), 11/85.

***Son olaraq onu demək istəyirəm ki, yuxarıda qeyd etdiklərimiz xoş sözlər və mühim nəsihətlərdir. Lakin bütün bu nəsihət və tövsiyələr lazım gəldiyi zaman tətbiq olunmadıqca və onlara uyğun addım atılmadıqca, bir parça kağız üzərində qalacaqdır.***

***Əziz qardaşlar! Evləriniz sizin məsuliyyətinizdir, onların islah edilməsi isə çiyinlərinizə düşən bir əmanətdir. O zaman gəlin bu tövsiyələri qəbul edərək və əməldə də göstərərək onlara riayət edək. Allah sizinlədir. O sizin əməllərinizi boş və mükafatsız buraxmaz!***

***Qardaşınız***
***Məhəmməd Saleh əl-Münəccid***